

*Dağlarda qar qalandı,*
*Yağdıqca qar qalandı.*
*Qarğalar laçın oldu,*
*Laçınlar qarğalandı.*
**Sarı Aşıq**

**№3(6)**
**2012**

**Bakı-2012**

**Laçın yurdu, №3(6), 2012**
**Bakı, "Bəxtiyar-4", 2012. 80 səh.**

Təsisçi və baş redaktor:
**Arif MƏMMƏDLİ**

Baş redaktorun müavini:
**Araz HACIYEV**

Redaktor:
**Siyavuş ƏMİRLİ**

Məsul katib:
**Elnur MEHDİYEV**



Redaksiyanın ünvanı:
**Sabit Rəhman küç. 7**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (050) 205-00-92, (050/055) 362-03-60**
**e-mail: lachinyurdu@mail.ru**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir
və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə
Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı 5 saylı TURAN şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı: **0137010002944**,
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**33821019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **CITIUS33**,
International Bank of Azerbaijan
Republic Yasamal Branch
kod: **805142**
USD only Account #:
**33822018403136196216**
**Mammadov Arif Kamran**
INN: **1401771462**

## Bu sayımızda

***Şəhidlərimiz***



***Abituriyent-2012***



***Publisistika***



***Dünya ədəbiyyatı***



***Kitab rəfi***



***Yubiley***



***Laçın folkloru***



***Araşdırma***



***JURNALIN NÖVBƏTİ SAYI***
***DEKABRDA İŞIQ ÜZÜ GÖRƏCƏK***

## BAŞ REDAKTORDAN

***Öncə 2012-2013-cü dərs ilinin başlanması münasibətilə təhsil sahəsində çalışan bütün oxucularımızı, müəllim və şagirdləri, tələbələri səmimi qəlbdən təbrik edir, cəmiyyətin sütunu sayılan milli ziyalılarımızın maddi vəziyyətinin layiq olduqları səviyyəyə yüksəldilməsini arzulayırıq!***

Əziz oxucular, jurnalımız nəşrə başlayandan tarixi gerçəklikləri, görkəmli şəxsiyyətlərin, şəhidlərimizin, Qarabağ qazilərinin, ziyalıların və qələm adamlarının tanıtımını daim diqqətdə saxlamışıq. Bundan sonra da ənənəmizə sadiq qalacaq, imkan daxilində ictimai-mədəni, sosial problemləri işıqlandırmağa çalışacağıq.

Xüsusilə, bir məsələyə aydınlıq gətirmək istəyirik. Belə ki, müxtəlif rubrikalar altında övladların öz ulu babaları, ata-anaları, mənsub olduqları nəsil haqqında yazılarına ayrı-seçkilik qoymadan həmişə yaşıl işıq yandırmışıq. Ola bilsin ki, bəzən övlad hissə qapılaraq təqdimatında mübaliğələrə yol verir. Əslində burada bir qəbahət də yoxdur. Danılmaz həqiqətdir ki, hətta məşhur qəhrəmanların həyatı qələmə alınanda müsbət keyfiyyətləri qabardılır, mənfi cəhətləri isə kölgədə qalır.

Bu kontekstdən yanaşsaq, övladın öz valideynini ən yüksək mərtəbəyə qaldırması çox təbii görünür. Amma ifrata varmağın tam əleyhinəyik. Əvvəllər yazdığımız kimi, bəzən insanın layiq olduğu səviyyədən artıq təriflənməsi istehzaya çevrilir, “qaş düzəltmək əvəzinə göz çıxarmaq”la nəticələnir.

Hərdən əksinə də olur. Xalq arasında, el-obada böyük nüfuz qazanmış insanların övladlarına müraciət edib ətraflı məlumat almaq istəyəndə laqeydliklə üzləşirik. Ya verdikləri sözü “unudur”, ya da onların barəsində hər hansı yazını qəzet və jurnal səhifələrinə çıxarmağı məsləhət görmürlər. Nəticədə balans pozulur, “təqdimata daha çox kimin haqq etməsi” yersiz mübahisə mövzusuna çevrilir. Təəssüf ki, milli mentalitetimizdən qaynaqlanan yanlış bir təsəvvür də yolumuzu kəsir. Necə deyərlər, dar dairələrdə kiminsə öz ata-babasından yazması ayıb sayılır. Məntiqə söykənməyən bu bəhanəni də əlinizdən almaq üçün atasından çox yazmasını ona irad tutanlara bir yazıçının ibrətamiz cavabını xatırlatmaq yerinə düşər: “Çünki atamı hamıdan yaxşı tanıyıram”!

Hörmətli oxucular, bir də nədən, kimdən yazmağınızdan daha vacib necə yazmağınızdır. Vicdanınızın səsinə qulaq asa-asa, yüz ölçüb bir biçə-biçə, beyninizin süzgəcindən, qəlbinizin odundan keçirə-keçirə ərsəyə gətirdiklərinizin sevilə-sevilə oxunacağına inanırıq. Hər birinizi jurnalımızla (jurnalınızla) əməkdaşlığa çağırırıq.

**P.S.** ***Güləbird kənd tam orta məktəbinin direktoru Tapdıq Abbasovu “Əməkdar müəllim”, istedadlı müğənni Məhəbbət Kazımovu isə “Əməkdar artist” fəxri adına layiq görülməsi münasibətilə təbrik edirik!***

## O KƏND BİZİM KƏNDİMİZDİ

### KÜRDHACI KƏNDİ

**Tarixi durumu:** Azərbaycanın gözəl və əsrarəngiz mahallarından biri olan Zəngəzur mahalında sayılıb seçilən obalardan biri də Kürdhacı kəndi idi.

17-18 may 1992-ci ildə Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğal edilmiş, ulu baba-nənələrimizin, ata-analarımızın beşiyi olmuş, doğma dədə ocağımız, ata yurdumuzun tarixi taleyinə – tarixi durumuna nəzər salmaq istədim.



Kürdhacı kəndi əvvəllər əsasən xərək, potuğa, qara dam, dam, şirvanı dam (yerli şəraitə uyğun yeraltı qazmadan düzəldilmiş olan tikililər) adlanan xüsusi tikililərdən tikilmişdir. Zaman ötdükcə yerli tikinti materiallarından daş evlər inşa edilmişdir. Hacısamlı Taxta Emalı Zavodu fəaliyyətə başladıqdan sonra zavodda müxtəlif növ taxtalar istehsal olunurdu. Kənddə evlərin damı bu zavodda palıd ağacından hazırlanmış taxta örtüklə bağlanırdı. Belə tikililərdən bir neçəsi ermənilərin törətdiyi məlum 1992-ci il hadisələrinə qədər qalırdı.

Yaşadığımız torpaq üzərində hər bir yerin-yurdun, dağ-dərənin, hər bir ərazinin adı onun tarixi, kimə məxsusluğu haqqında çox şey deyir. Yer-yurd adlarını orada yaşayan insanlar öz dillərinə, xarakterlərinə, yaşadıqları yerin təbiətinə uyğun adlar verirlər. Kürdhacı kəndinin də adı bizə keçmişimizdən, dədə-babalarımızdan, ana dilimizdən xəbər verir. Bu ad öz ilkin formasını bir neçə dəfə dəyişmişdir.

Kürdhacı kəndinin ərazisi hələ 1727-ci ildə Mağavuz nahiyəsi Xaçın məlikliyinin tərкibində qərar tutduğu bir vaxtda Osmanlı dövləti Mağavuz nahiyəsinin oba, kənd, qışlaq və məzrələrini siyahıya alıb. Həmin siyahıda belə bir qeyd var: “Qurd Qacı məzrəsi. Bu məzrə Mağavuzdadır.”

Nadir şah Qırxlı-Avşarın ölümündən sonra XVIII yüzilliyin ortalarında artıq Qarabağ xanlığı yaranmışdı. Bu olaylardan sonra Xorasan əyalətində duruş gətirə bilməyən Qasım Hacı Sam oğlu da uruğ-turuğunu toplayıb, Qaraçorlu mahalına, yaxın qohumu, qardaşı oğlu Şirin bəy Hüsən bəy oğlunun yanına köç etmişdir. Şirin bəy Qasıma Qurdhacı torpağını tuş vermişdi. Həmin tayfa orda binə bağlamışdır. Bəzi mənbələrdə Qasım Hacı Sam oğlunun bu torpaqları Hüsən bəyin oğlu Şirin bəydən aldığı qeyd edilmişdir. Şirin bəy Hacı Samın nəvəsi idi.

Həmin dövrdə – XVIII əsrin ortalarında kənd Qasımuşağı adlandırılsa da, sonralar onu yenidən Qurdqajı adlandırmışlar. Müəyyən zaman ərzində Qurdqajı sözü müxtəlif dəyişikliyə (əsasən tərcümə zamanı) uğramışdır. Əli Umud oğlu Əliyevin apardığı araşdırmalar nəticəsində məlum olmuşdur ki, bu kəndin adının Qurdqajı olduğunu sübut edən sənəd Respublika Dövlət Tarix Arxivində 123-cü fondun 7 saylı işin 155-169-cu səhifələrində özünü qoruyub saxlayır. Bu qeydiyyat 1848-ci ildə qeydə alınmışdır. İnsan və ya millət adından sonra hacı sözünü (titulunu) işlətmək olmaz. Türkhacı, Özbəkhacı ola bilmədiyi kimi kürd və ya qurdhacı da ola bilməz. Həmçinin həccə gedən şəxsin titulu onun adının əvvəlində işlənir. Odur ki, bu kəndin əsl adı Qurdqajıdır. Qədim dövrlərdə türkləri qurd adlandırmışlar. Əbülqasım Firdovsi isə türklərin yaşadığı ölkəni "Qurdlar ölkəsi" adlandırmışdır. Beləliklə, lap qədimdən qurd türk millətinin onqonu sayılmışdır. Qurdqajı sözü mürəkkəb söz olmaqla iki hissədən ibarət olan qurd və qaj (qac, qəc) sözlərindən alınmışdır. Türkdilli xalqlar arasında qurd sözü bildiyimiz kimi igid, mərd, qoçaq mənasında işlənir. Bu söz bizim dilimizdə öz mənasını bu günə qədər də saxlamaqdadır. "Filankəs qurd adamdır", "Filankəs köhnə qurddur" ifadələrində olan bu sözlər də yuxarıdakı mənalarda işlənmişdir. Sözün ikinci hissəsi olan "qajı" sözü dilimizdə bu günə qədər də işlədilən qajı sözüdür. Bu söz hazırda rayon və kəndlərimizdə arx, lək, çala, dərə mənasında işlədilir. Beləliklə, Qurdqajı sözünün ikinci hissəsi olan qaj sözü dərə mənasında işlənmişdir. Göründüyü kimi Qurdqajı – igid dərəsi, mərd (qoçaq) dərəsi mənasında işlədilmişdir. Kəndin yerləşdiyi ərazi el arasında ümumilikdə Qasımuşağı dərəsi və yaxud Qasımuşağı obası adlandırılırdı.

Kəndin ərazisində Qafqaz Albaniyası dövrünə aid tikinti qalıqları, müxtəlif səpkili, müxtəlif tipli yazılı daş abidələr, Alban qəbiristanlığının

qalıqları qalmışdır. Daşın başı, Daşın altı adlanan ərazilərdə belə qəbiristanlıq qalıqlarına və daşüstü yazılara rast gəlmək olurdu.

Mənəvi sərvətlərimizi min bir yolla oğurlayan mənfur erməni qonşularımız Kürdhacı kəndi ərazisində olan müxtəlif tipli tarixi Alban abidələrini də müxtəlif yollarla, dəyişikliklər aparmaqla özününküləşdirməyə çalışmışdır.

**Mədəniyyəti:** Kəndin iqtisadi-ictimai həyatındakı müəyyən yüksəlişlər keçən əsrin əvvəlində ətraf kəndlərə nisbətən daha yaxşı hiss olunurdu. Kənddə kustar üsulla ip əyirilməsi, xalça toxunulması çox-çox əvvələrə təsadüf edir. Demək olar ki, bir çox ailələrdə toxucu dəzgah (hana və yer hanası) var idi. Onlar hazırladıqları yun, pambıq iplərdən xalça, kilim, palaz, farmaş, xurcun, şəddə, yun şal (parça) və digər məmulatlar toxumağı bacarırdılar. Kürdhacı kəndi Qarabağ xalçaçılıq məktəbinin xalça məntəqələrindən biri idi. Burada gözəl Qarabağ xalçaları toxunurdu. Bu günə qədər qorunub saxlanan Qarabağ xalçaçılıq məktəbinin Cəbrayıl qrupuna aid edilən "Qasımuşağı xalçaları" və "Qasımuşağı tikmələri" Hacısamlı nahiyəsinin inzibati ərazi vahidində yerləşən Kürdhacı kəndində də toxunmuşdur. Bu gün də toxunmuş belə xalçalar kənd əhalisinin şəxsi kolleksiyasında saxlanmaqdadır. “Qasımuşağı xalçaları” Kürdhacı kəndində və ətraf kəndlərin əhalisi arasında “Ağqol gəbə” (“Ağqol xalça), “Tikmə gəbə” (“Tikmə xalça”) adlandırılır.

Kəndin ətrafı sıx meşəliklər olduğundan xarratlar palıddan və vələsdən müxtəlif məişət əşyaları hazırlayırdılar. Qab-qacaq, o cümlədən təknə, nehrə, cəhrə, çanaq, qollu tərəzi, daraq (yun daramaq üçün), hana (xalça toxumaq üçün), yer hanası (şəddə, örkən toxumaq üçün), çəllək belə əşyalara misal ola bilər.

Kürdhacı kənd camaatı digər bayramlardan fərqli olaraq Novruz bayramını xüsusi təntənə ilə qeyd edərdi. Kiçik çillənin gəlişi ilə fevral ayının əvvəlində “Xıdır Nəbi” oyunları başlayar, uşaqlar və cavanlar, “Təkə” bəzəyər, “Tülkü” gəzdirər, yumurta döyüşdürər, xoruz döyüşdürər, müxtəlif xalq oyunları oynayardılar. Təzə gəlinlərə, nişanlı qızlara, qohumlara xonçalar aparılar, bayram hədiyyələri verilərdi.

Kənd sakinləri bir-birinə yaxın qohum olduğundan kəndin xeyirşərini camaat yığışıb yola verərdi. Ev yiyəsinin heç bir işdən xəbəri olmazdı. Hətta ətraf kəndlərdən belə köməyə gələrdilər. Bütün çətin işləri yola vermək üçün “hav” (iməcilik) edər, birlikdə çalışardılar.

Kənd vaxtilə saxsı borularla su ilə təmin edilmişdir. Torpaq uçuntusu və qazma işləri aparılarkən bu boruların qalıqlarına rast gəlinirdi.

Bundan əlavə kəndin bağ və bostanları arxlarla suvarılırdı. Son dövrlərdə kəndə dəmir və plastik borularla su çəkilmişdir.

Kəndin ərazisində daşdan və taxtadan tikilmiş su dəyirmanları mövcud olmuşdur. Onlardan bəziləri 1992-ci ilə qədər işlək vəziyyətdə qalırdı. Qədim yaşayış məskəni olan Kürdhacı kəndində Bəzirxana adlanan yerdə dəyirman var idi. Bu dəyirmanda zəyərək (kətan) bitkisindən zəyərək yağı istehsal edilmişdir. Belə dəyirmana ətraf kəndlərin ərazisində də rast gəlmək olurdu.

Kəndin qəbiristanlığı isə ən qədim qəbiristanlıqlardan biridir. Yaxınlıqda olan kəndlərdə qəbiristanlıq olmadığı zaman həmin kəndlərdə rəhmətə gedənlər də bu qəbristanlıqda dəfn olunardı. Sultan bəy Sultanovun atası Əlipaşa bəy Sultanovun məzarı da bu qəbiristanlıqdadır. Kənd qəbiristanlığında daşdan yonulmuş qəbirüstü iki qoç və at fiquru olmuşdur. Ancaq hayların (ermənilərin) olduqca hiyləgər siyasəti nəticəsində onlar oğurlanmış və məhv edilmişdir.

Kürdhacı kəndi Ermənistan Silahlı Qüvvələri tərəfindən işğal edilənədək orada orta məktəb, bağça, klub, kitabxana, rabitə şöbəsi, xəstəxana, yağ-pendir emalı zavodunun filialı və iki mağaza fəaliyyət göstərirdi.

**Coğrafi mövqeyi:** Qədim zamanlardan insanlar yaşayış yerlərini su, qida, istilik, eləcə də təhlükəsiz (əsasən təbii fəlakət zonalarından uzaq) olan sahələrə salırdılar. Kürdhacı kəndi də belə bir ərazidə salınmışdır. Kənd respublikanın paytaxtı Bakı şəhərindən şose yolla 503 km qərbdə, rayon mərkəzindən şose yolla 53 km şimal-qərbdə, Qarabağ silsiləsinin cənub-qərb yamacında dəniz səviyyəsindən təxminən 1741 m yüksəklikdə yerləşir. Xankəndi dəmiryolu stansiyası ilə şose yolla ara məsafəsi 113 km-dir. Şərqdən Çorman, cənub-şərqdən və cənubdan Xaçınyalı, cənub-qərbdən Hacısamlı, şimal-qərbdən Muncuqlu, şimaldan və şimal-şərqdən Ərikli kəndlərinin ərazisi ilə həmsərhəd olan kənd meşə və çay kənarında, uca dağlar qoynunda yerləşmişdir.

Digər ətraf kəndlər kimi Kürdhacı kəndinin ərazisində də çoxlu sıldırım qayalı, başı qışda ağ, yayda yaşıl örpəkli dağlar, dərin dar dərələr, sıx meşələr, kollu yamaclar, yamyaşıl talalar və çiçəkli çəmənliklər vardır.

Meşələrində adı "Qırmızı Kitab"a düşmüş qırmızı palıd, közü gec sönən, həmişəyaşıl ardıc, çoxlu dərman bitkiləri bitir. Kəndin meşələrində meşə əmələ gətirən əsas ağac cinslərindən ən geniş yayılanı palıd və vələsdir. Bu ağaclar ən qədim dövrlərdən son zamanlara qədər bütün tikinti işlərində, müxtəlif alət və avadanlıqların düzəldilməsində istifadə edilirdi. Cır alma, cır armud, alça, yemişan, fındıq, zoğal, qoz, qaragilə,

giviş, əzgil, qarağat, moruq, həmərsin (itburnu və yaxud dərgil), zirinc, dovşan alması və s. meyvə ağac və kolları meşələrin bəzəyidir. Meşələrin heyvanlar aləmi də çox rəngarəngdir. Ayı, canavar, çöl pişiyi, çaqqal, tülkü, porsuq, gəlincik, dələ, vaşaq, əlik, qaban, dovşan, kirpi və digər heyvanlar bu meşələrin daimi sakinləridir. Quşlardan qaratoyuq, bülbül, ağacdələn, şanapipik, sərçə, qartal, quzğun, qızılquş, qırğı, çobanaldadan, bildirçin, alacəhrə, alabaxta, göyərçin, qaranquş, arıquşu, qarğa, alaqarğa, cur-cur, zığ-zığ və başqa quşlar yaşayır.

Bu bölgədə dağ, təpə, dərə, çökək, yal, yamac, zirvə, silsilə, gəz, aşırım, sıra dağ, tirə, qol, tala, meşə və sairə vardır. Bu yer-yurdun hər biri ayrı-ayrılıqda hansı səbəbdənsə bir adla adlandırılmışdır. Bu adların mənası və yaranma tarixi, mənşəyi ən azı orada yaşayan əhali üçün çox dəyərli və önəmlidir. Kəndin ərazisində hər yerin öz adı var: Pirin başı, Yal yolu, Taxtalar, Düzlər, Kilsə yeri, Donuzlar damı, Əhəng quyuları, Qızıl qaya, Darı yeri, Sarı yarğan, Böyük oyuq, Kiçik oyuq, Orta güney, Qatar qaya, Kolavat, Almanın gərdəni, Kənd yeri, İnək piri, Duzlağın yalı, Qaranquş qayası, Çınqılın yalı, Binə, Bəzir yeri, Qarapalçıq, Ayrankəsən, Qaraxanköçən, Qunçanın yurdu, Pirinin yeri, Qobu, Şırlan dərəsi, Vəzzox, Bəzirxana, Arxaş yeri, Alçalı təpə, Qənşər göl, Şiney dağ, Xırdalar, Gülpərinin yurdu, Tək palıd, Daşkəsən, Nal daş, Arpa dərəsi, Həlmə yuyulan, Dik yer, Zoğal ağacı, Baş yol, Orta yol, Aşağı yol (Alt yol), Zağalar, Qurban təpəsi, Səngər yeri, Xev, Arxana (Arıxana), Gorgahat, Ələkbərin dəhnəsi və s.

Muncuqlu çayı (bəzən yerli əhali arasında Qozluçay adlandırılırdı) kəndin şimaldan Muncuqlu kəndi və Hətəmlər kəndi ilə olan sərhədlərini, Şəlvə çayı isə qərbdən Hacısamlı ilə olan sərhədləri tamamlayır. Ərazidə olan Kürdhacı və Tükəzban paltaryuyan çayları kəndin ərazisindəki dağlardan, yüksəkliklərdən başlayır, Şəlvə çayına qoşularaq Həkəri çayı istiqamətində axır. İqlim şəraitindən asılı olaraq çayların suyunun həcmi fəsillər üzrə artıb azalır. Yaz və payız aylarında kəndin ərazisində olan Quru göl, Göl adlanan ərazidəki Böyük göl (Camış göl), Orta göl, Kiçik göl gölləri də yağıntının miqdarından asılı olaraq öz ərazilərini genişləndirir.

Zirvəsi daim dumanlı, ağ örpəkli uca dağları, qışda ağappaq, yayda yamyaşıl yorğana bürünmüş meşələri, kənarı hay-küylü çayları bulaqlarsız təsəvvür etmək günah olardı. Burada hər bulağın öz dadı, adı və mənzərəsi könül oxşayır. Kəndin şimal-şərqində Quzey bulağı, şərq tərəfində Daş bulaq, Novlu bulaq, Sarı bulaq, İmamverdi bulağı, Qırx bulaq, cənub tərəfində Göy bulaq, qərb tərəfində Qoç nalı bulağı, Paşa bəyin bu-

lağı, Fındıqlı bulaq, şimal tərəfində Kor bulaq, Palçıqlı bulaq, Səltənətqaçan bulaq və başqa bu kimi çeşmələri göstərmək olar.

Kənd əhalisi soyuducu olmayan bir dövrdə buz bulaqlardan soyuducu kimi istifadə etmişdir. Bulaqların yaxınlığında müxtəlif növ qurğular düzəldərək ərzağı orada saxlayardılar. Hətta günlərlə orada qalan məhsul öz keyfiyyətini, təravətini olduğu kimi saxlayırdı. 1990-cı illərin əvvəllərinə qədər əhali yaylaqda olarkən və ot biçini zamanı bu üsuldan istifadə edər, süd-qatıq və ayranı bu üsulla soyuq saxlayardılar. Buzxana adlanan yerdə isə yazın son aylarında, yay fəslində xəstələrə buz tapmaq olardı.

Bu yerlərin mürəkkəb relyefi, sərt iqlimi bütün amillərə öz təsirini göstərir. Burada iqlim yayda sərin, qışda soyuq olur. Orta illik temperatur 1°C ilə 7°C arasında dəyişir. Yağıntıların illik miqdarı 700-800 mm-ə qədər olur.

**Camaatın ictimai həyatı:** Kürdhacı kəndinin gözəl coğrafi mövqeyinə, uca zirvələrinə, füsunkar təbiətinə uyğun gözəl insanları vardır.

Kənd əhalisi milliyyətcə azərbaycanlılardan (azərbaycan türklərindən) ibarətdir. Kənd əhalisinin az olmasına, ümumilikdə Qasımuşağı tayfası adlandırılmasına baxmayaraq onlar bir neçə tayfa və tirələrə ayrılmışdır. Son zamanlar kənddə olan tayfalar – Nəbiuşağı tayfası (tirələri: Bayramlı, Şəvəndələr, Elyaslar), Mollahəsənli tayfası, Əhmədușağı tayfası, İbrahimuşağı tayfası idi.

XVIII yüzilliyin sonu, XIX yüzilliyin əvvəllərində Qərbi Azərbaycanda baş vermiş təkmillətli Ermənistan Respublikası yaratmaq məqsədi ilə oradan sürgün edilmiş bir neçə ailə Kürdhacı kəndində məskunlaşmış, burada yaşayan əhali ilə qaynayıb qarışmışlar.

1981-ci ildə kənd əhalisinin sayı 386 nəfər olmuşdur. 2009-cu il dekabr ayına olan məlumata əsasən kənd əhalisinin sayı 566 nəfər (117 ailə) olmuşdur.

Dövrünün savadlı adamı, Mollahəsənli tayfasından olan Molla Xudaverdi Tanrıverdi oğlu (1835-?) kənddə uşaq və yeniyetmələrə "əlifbeyi" öyrədər, mədrəsə təhsili verərdi. Sultan bəy və Xosrov bəy qardaşları kimi onlarla uşaq Molla Xudaverdinin yanında oxuyub, mədrəsə təhsili almışdılar.

Ulu baba-nənələrimiz, ata-analarımızın beşiyi ana torpaq zirvələri ilə, hər bir xalq qəhrəman övladları ilə qürurlu görünür, tanınır, dəyərləndirilir. Bu kəndin də belə övladları olmuşdur. Müdrik kəlamlar ustadı, el ağsaqqalı, öz ədaləti ilə tanınan, Hacısamlı nahiyəsinin bəyi Paşa bəy

Sultanov, Azərbaycan Demokratik Respublikasının ilk müdafiə naziri, Qarabağın general-qubernatoru, həkim Xosrov bəy Sultanov və Xalq qəhrəmanı, öz cəsarəti ilə sayılıb-seçilən, Hacısamlı nahiyəsinin bəyi Sultan bəy Sultanov, Azərbaycanın Milli Qəhrəmanı Ələsgər Novruzov bu kənddə anadan olmuşlar.

Kommunistlərin fitvası ilə kolxozlaşma dövründə aparılan repressiya zamanı Kürdhacı kəndi də bir çox çətinliklərlə üzləşdi. Kənd əhalisi nə qədər fəallıq göstərsə də repressiya dövrü qurbansız ötmədi: 55 yaşlı Şahnəzərov Salman Muradxan oğlu (1883-18.03.1938) günahsız olduğu halda həbs olundu və güllələndi.

Böyük Vətən Müharibəsinin ilk günlərindən sonunadək Kürdhacı kəndindən aşağıda adları qeyd edilənlər bu müharibədə iştirak etmişdir: Ağakişiyev Bulud Atakişi oğlu, Ağakişiyev Ağakişi Lələ oğlu, Bəxtiyarov Bəxtiyar Uğurlu oğlu, Bəxtiyarov Həsən Cavad oğlu, Cabbarov Həsən Firudin oğlu, Cabbarov Hüseyn Firudin oğlu, Cabbarov İsrafil Firudin oğlu, Cabbarov Qaçay Firudin oğlu, Cabbarov Umud Abdulla oğlu, Hüseynov Əli Həsənalı oğlu, Hüseynov Nemət Niftalı oğlu, Qəhrəmanov Murtuza İbrahim oğlu, Quliyev Misir İbadulla oğlu, Quliyev Nəsir İbadulla oğlu, Quliyev Müsləddin İbadulla oğlu, Quliyev Sədrəddin İbadulla oğlu, Mayılov Mayıl Zeynalabdın oğlu, Muradov Əliş Abduləzim oğlu, Muradov Fərman İsbəndiyar oğlu, Muradov Məhəmməd İsbəndiyar oğlu, Musayev Qara Allahverdi oğlu, Novruzov Bəylər Ələkbər oğlu, Novruzov Əkbər Ələkbər oğlu, Novruzov Xanlar Ələkbər oğlu, Novruzov Niyaz Əsgər oğlu, Piriyev Əhəd Aslan oğlu, Şahnəzərov Bəylər Kalbalı oğlu, Tapdıq Fətulla oğlu və digərləri.

Müharibə sadə söz olmaqla səkkiz hərfin birləşməsindən əmələ gəlsə də, göz yaşları, qırğınlar, talanlar, əlillik, valideynsiz uşaqlar, dul qadınlar kimi dəhşətli ifadələrlə sonuclanır. Böyük Vətən Müharibəsinin acı nəticələri ilə yanaşı, Kürdhacı kəndinin əhalisi də böyük itkilərlə üzləşdi və kənddən müharibəyə gedən bu insanlardan bir çoxu geri qayıtmadı.

Kənd əhalisindən Qarabağ müharibəsi zamanı şəhidlik zirvəsini fəth edən Xəqani Həsən oğlu Axundov (1950-1993) olmuşdur.

**İqtisadi vəziyyəti:** Heyvandarlığın, əkinçiliyin inkişafi üçün bol suyu, münbit torpağı, əlverişli təbii şəraiti, iqlimi, ərazinin yaylaqlara yaxın olması səbəbindən əhalinin əsas məşğuliyyəti heyvandarlıq və əkinçilik olmuşdur. Heyvandarlıq çox güclü inkişaf edərək əsas sahələrdən birinə çevrilmişdir. Kənddə yaşayan insanlar əsasən heyvandar-

lıqla məşğul olduğundan əhalinin bir hissəsi elatlıq edər, kənddə yaşayış mövsümi xarakter daşıdığından bəzən bu kəndlərdə əhali müəyyən vaxt ərzində yaşayar, sonra ya yaylağa, yaxud da qışlağa köç edərdi. Ancaq kənddə qalan qadınlar toxuculuq işləri ilə məşğul olardı. Xalçaçılıq bu obada yaşayan əhalinin əsas məşğuliyyəti olmuşdur.

Əkinçilik kəndin güzəranında ikinci yeri tutmuşdur. Əkinə yararlı sahələrdə buğda, arpa, vələmir, darı, pərinc, çovdar, qarğıdalı və başqa dənli bitkilər, eləcə də çoxillik yem bitkiləri yetişdirilmişdir. Qarapalçıq adlanan sahədə susuz (dəmyə) kartof becərilmişdir. Meşədə bitən cır meyvə və giləmeyvələrdən qax hazırlanır, müxtəlif məqsədlər üçün istifadə edilirdi. Bunlardan əlavə arıçılıq, ərazidə sıx meşələr olduğundan taxta-şalban istehsalı, kömür və əhəng istehsalı (kənd ərazisi əhəng istehsalına yararlı Laçın əhəng daşı ilə zəngin olduğundan əhəng daşı yandırmaq), dərman bitkilərinin toplanıb təhvil verilməsi də əhalinin məşğuliyyət növlərindən idi. Kənddə hər kəs öz bacardığı işi yerinə yetirməyə çalışardı.

Kənd camaatı saxladığı heyvanları və hazır məhsulları (heyvandarlıq məhsulları, arıçılıq məhsulları, xalça məmulatlarını) və məişət əşyalarını təkcə kənd əhalisi üçün hazırlamaz, əhalinin maddi vəziyyətlərini yaxşılaşdırmaq üçün yaxınlıqdakı bazarlara, habelə aran zonasındakı bazarlara çıxarar, ehtiyac duyulan ərzaq, təsərrüfat və sənaye mallarına dəyişdirər, yaxud da nağd pula satardı. 1905-1907-ci il hadisələrinə qədər belə məhsulları Qərbi Azərbaycanın Gorus və Qarakilsə bazarlarına da çıxarardılar.

Sovet Sosialist Respublikaları İttifaqı yarandığı ilk dövrlərdə iqtisadi vəziyyət xeyli gərgin olaraq qaldı və məcburi surətdə kolxoz quruldu. Bir müddət sonra yaxşılığa doğru irəliləyiş hiss olunsa da, bu çox sürmədi, kolxozlaşma dövrü və 1937-ci il repressiyası zamanı kənd əhalisinin dərd-səri bir az da artdı.

Vəziyyətin belə ağır olduğu bir vaxtda Kürdhacı kəndi daha bir çətinliklə üz-üzə qaldı. XX əsrin 20-30-cu illərində yaranmış beynəlxalq münasibətlər 1939-cu il sentyabrın 1-də yeni bir dünya müharibəsini qaçılmaz etdi. Müharibə başlayandan bir müddət sonra Almaniya SSRİ torpaqlarını tutmaq qərarına gəldi. 1941-ci il iyun ayının 22-də səhər saat 4-də Almaniya qəfildən SSRİ-yə hücum etdi və bununla “Böyük Vətən Müharibəsi" adlandırdığımız müharibə başladı.

Müharibənin ilk günlərindən son günlərinədək kənddə uşaqlı-böyüklü hər kəs arxa cəbhədə əzmlə çalışmışdır. Məlumdur ki, müharibə

sovet xalqının qələbəsi ilə başa çatdı. Ancaq Kürdhacı kəndində iqtisadi vəziyyət ağır olaraq qalırdı. Bu bölgədə ağır iqtisadi durumu aradan qaldırmaq məqsədilə Hacısamlı kəndində Böyük Vətən Müharibəsindən sonra 1940-cı illərin sonu, 1950-ci illərin əvvəli Azərbaycan Taxta Emalı Sənayesi Nazirliyinin Laçın Meşə Təsərrüfatı İdarəsinin nəzdindəki Hacısamlı Taxta Emalı Zavodu quraşdırıldı və işə salındı. Kürdhacı kənd sakinlərinin bir çoxu burada işlə təmin olundu.

Böyük Vətən Müharibəsindən sonra kənd əhalisi kənd mühitinə qapanıb qalmadı. 1950-ci illərdə kənddə vəziyyət getdikcə yaxşılaşmağa başladı. Təhsilin vəziyyəti də yüksəlişə doğru dəyişdi. Artıq 1960-cı illərdə iqtisadi vəziyyət daha da yaxşılaşdı. Kənd rabitə və elektrik enerjisi ilə təmin edilmişdi. 1970-ci illərdə bütün sahələrdə yüksəliş tam hiss olunurdu. 1980-ci illərdə kənddə vəziyyət xeyli yaxşılaşdı. Lakin bu dövrdə Sovet imperiyası zəifləməyə başladı. Bu imperya I Pyotrun vəsiyyətinə uyğun şəkildə tabeliyində olan ölkələri itirməmək üçün əzəli və indiki düşmənimiz olan erməniləri bizimlə müharibəyə sürüklədi. Torpaq iddiası ilə 1988-ci ilin əvvəllərindən ermənilər müharibəyə başladı. Nəhayət, 1992-ci il may ayının 18-i günü artıq kəndin ərazisi döyüş meydanına çevrildi. Kənd 29 may 1992-ci il tarixə qədər müdafiə olunsa da, sonda Ermənistan ordusu tərəfindən işğal edildi, yaşayış evlərinin əksəriyyəti yandırıldı. Azərbaycan Silahlı Qüvvələri tərəfindən azad edilən kənddə yaşayış yenidən bərpa edilsə də, 2-3 aprel 1993-cü il tarixdə Kəlbəcər rayonunun işğalından sonra mühasirədə qalan kənd sakinləri kəndi tərk etdilər.

Kənd əhalisi respublikanın müxtəlif bölgələrində məskunlaşdı. Həmin dövrdən xeyli vaxt ötmüş, bu gün kəndin keçmiş adət-ənənələri itib-batmaq üzrədir. Gənc kənd sakinlərinin çoxu bir-birini tanımır. Bu çatışmazlığı aradan qaldırmaq isə bizlərin çiynində ağır bir yükdür.

Allah bizlərə yar olsun!



**Sultan HÜMBƏTOV**

## TARİXİ ABİDƏLƏRİMİZ

# MƏŞƏDİ MEHRALI KÖRPÜSÜ



Bahadur müəllimin (Bahadur Nəcəfov) yaradıcılıq işinin bir hissəsi Azərbaycanın Laçın rayonu və həmin rayonun Pircahan kəndi haqqında mikroantropoloji və etnoqrafik toponimlərini tarixi araşdırmaları ilə bağlıdır. Bu mövzunun tədqiqini atam 1980-ci ildən bəri zərrə-zərrə toplayaraq zəhmətlə, əziyyətlə, atamın öz sözü ilə desəm, "gözünün nurunu" itirmək bahasına ərsəyə gətirmişdir. Ömür vəfa etmədiyi üçün onun bu şərəfli və məsuliyyətli işini övlad borcu olaraq mən öz üzərimə götürmüşəm. Əsərin bir hissəsi bu yazı mətninin içərisində olduğu kimi (yazı mətninin bir qismi "Ağrıdağ" qəzetinin 29 aprel–5 may 1989-cu il tarixli sayında dərc olunmuşdur) verilir.

"Azərbaycan Respublikası, Laçın rayonu, Pircahan kəndinin mikroantropoloji və etnoqrafik toponimləri"

Hər söz bir tarixdir deyiblər. Tariximizin gözügötürməyənlər tərəfindən məhv edilməsi, adların saxtalaşdırılması və ya erməniləşdirilməsi bu barədəki araşdırmalara zəruri ehtiyac yaradır. Adlar getdi tarix batdı, tarix batdı millət öldü. Ona görə də ilk növbədə adlar qorunub saxlanmalıdır.

Çox böyük ürək ağrısı və təəssüf hissilə qeyd etməliyik ki, Laçın torpağı hələ də erməni işğalı altındadır. Bu torpaqda ad və ya tarixi abidələrimizə qarşı aparılan vandalizm indi də açıq-aşkar davam etdirilir.

Azərbaycan tarixində mühüm əhəmiyyətə malik maddi mədəniyyət abidələrindən biri olan, Laçının tarixi abidələri içərisində XVIII əsrin axırı və XIX əsrin əvvəllərində inşa edilmiş Pircahançay üzərindəki Məşədi Mehralı tağbənd körpüsü kəndin 4-5 km-də yerləşir, Həkəri çayının yuxarı hövzəsindədir. Pircahanlı Behbudalıyev Məşədi Mehralı Məşədi Mərdan oğlu bu körpünü öz şəxsi vəsaiti hesabına tikdirmişdir.

Əsrlərin amansız sınaqlarından uğurla çıxmış bu əzəmətli tarixi abidənin divarları yumurta ağı qarışığı ilə hörülmüşdür. Körpü tikilib qurtarandan sonra onun ilk çay daşqınından uğurla çıxması münasibətilə Məşədi Mehralı naxırından bir neçə tuncu cöngə ayırıb kəsdirmiş və ətini qurban payı kimi kəndbəkənd əhaliyə paylatmışdır. Körpü Laçının ucsuz-bucaqsız yaylaqlarına dartınan Qarabağ, Mil, Muğan, Təklə və hətta Şirvan köçəri əhalisinə, o cümlədən də 60 minlik Laçın əhalisinin yarıdan çoxunu əhatə edən 60-dan artıq kəndə eyni səxavətlə illər boyu təmənnasız xidmət göstərmişdir.

Xatırladaq ki, Məşədi Mehralı Məşədi Mərdan oğlu Bevdalıyev (Behbudalıyev) Pircahan kəndinin himqoyanlarının 4-cü nəslinə mənsub olan beş qardaşdan biridir (Bu yazı müəllifinin – Bahadur Nəcəfovun ata babası Nəcəfalı (Nəcəf) isə həmin qardaşlardan ən kiçiyidir).

Hələ çox-çox əvvəllər xain erməni qəsbkarları körpünün partladılıb məhv edilməsinə nail olmaq üçün əhali arasında belə şayiə yaymışlar ki, körpünün hər iki bünövrəsində qiymətli xəzinə var. Bu hiylə ilə körpünü məhv etmək istəmişlər. Lakin körpünü tikdirmiş kişinin törəmələri və el, camaat belə şayiələrin qarşısını almış, körpünün 1992-ci il işğalına qədər salamat qalmasına, nəhayət ki, nail olmuşlar. Bu cür şayiələrlə ermənilər körpünün 200–300 metr şimal-qərbində, çayın sol sahilində yerləşən ulu kökdən qalma "Qışlaq" adlanan qəbiristanlıqdakı daş heykəlləri, qarşı-qarşıya dayanmış nəhəng daş qoçları və s. qəbrüstü məbəd və abidələri, onlara aid daş yazıları partladıb məhv elətdirməyə nail olmuşlar (guya onların da içərisində qızıl gizlədilmişdir deyərək). İndi bu körpüdən əsər-əlamət belə qalmayıb. Erməni xəyanətkarları başqa əvəzsiz mədəni-tarixi abidə və məbədlərimiz kimi, onu da partladıb məhv etmişlər.

Körpüdən təxminən 200 metr qərbdə, çayın sağ sahilində "Məşədi Mehralılar" deyilən geniş bağlar və maldarlıq binələri cərgələnirdi. Həmin tikililərdən işğala qədər 11 kəndi əhatə edən və mərkəzi də Pircahan kəndi olan sovxoz da hazır heyvandarlıq bazası kimi uzun illər istifadə edib faydalanmışdır.

Beləliklə, Pircahanlı Məşədi Mehralının öz şəxsi vəsaiti hesabına tikdirdiyi bu möhtəşəm tarixi abidəni indi ancaq foto-şəkildə görmək mümkündür.

Laçında Ağoğlan məbədi deyilən bir tarixi abidə də var. Bu məbədin tarixi daha qədimlərə gedib çıxır. Ermənistanla sərhəd xəttinin yaxınlığında yerləşdiyindən ermənilər vaxtaşırı bu qədim tarixi abidənin "ziyarətinə" gəlmiş, hər gedəndə də özləri ilə heç olmazsa bir daş götürüb aparmağı da unutmamışlar.[1] Elə daşları ki, onları ancaq texnikanın gücü ilə söküb, üzərindəki qədim türk yazılarını erməniləşdirmək üçün İrəvana, Gorusa aparmış, "işlərini" görüb qurtardıqdan sonra yenə gətirib öz yerinə hörmüşlər.

Bəşəriyyət tarix boyu çox xəyanətlər görüb, lakin tarixi abidələrin dəyişdirilərək erməniləşdirilməsi kimi xəyanəti bəşər övladı ermənilərdən başqa heç kimdə görməmişdir. Bu, həqiqətən də bəşər tarixində yalnız ermənilərə məxsus nadir xəyanətdir. Onun ağır zərbəsi təkcə bir xalqa, bir millətə və ya bir ölkəyə dəyən zərbə deyildir. Belə xəyanətlərin acı nəticələri bütün dünya tarixinə, bütün bəşər övladına dəyir..."

**Xalid BAHADUROĞLU**

## KİMLƏR KEÇDİ BU DÜNYADAN

### ATALAR VƏ OĞULLAR

***Zirvədə zirvənin qədri bilinməz,***
***O, gözdən itəndə hayıf deyərlər.***
**Hüseyn ARİF**

Biz əhalinin bütün təbəqələri tərəfindən birmənalı olaraq qəbul edilən, səmimi, halal, gözükönlü tox, dövlətin qanunlarına həmişə hörmətlə yanaşan və cəmiyyətdə böyük nüfuz qazanan insanlardan söz düşəndə Oqtay Həsənovun adını tez-tez eşidirdik. Çox təəssüf ki, nəsillərə nümunə ola biləcək bu dəyərli ziyalımızdan müsahibə almaq arzumuz gerçəkləşmədi. Yenə də günahı vaxt qıtlığının üstünə yıxa-yıxa, bu günün işini sabaha qoya-qoya daha bir eloğlumuza sağlığında qiymət verməyi bacarmadıq. O isə haqq dünyasına qovuşdu. Sadaladığımız müsbət mənəvi keyfiyyətləri ona irs qoyub gedən atasının dünyasına. Sonrakı peşmançılıq fayda ver-



*Hüseyn Həsənov*

[1] Bax: "Elm və həyat" jurnalı. № 4, 1989.

məsə də, ata-oğul barədə qısa bioqrafik məlumatları diqqətinizə çatdırmaqla hər ikisinin ruhuna rəhmət diləyirik.

Əziz oxucular, ətrafınızda belə insanlar yaşayırsa, vaxt itirmədən görüşün, söhbətləşin, bizi onların haqqında yazmağa tələsdirin, məcbur edin ki, sonradan təəssüflənməyək...

Həsənov Oqtay Hüseyn oğlu 1938-ci ilin mayında Laçın rayonunun Səfiyan kəndində müəllim ailəsində anadan olmuşdur.

Atası Həsənov Hüseyn Abbas oğlu 1912-ci ildə indiki Laçın rayonunun Səfiyan kəndində kəndli ailəsində anadan olmuşdur. 1934-1972-ci illərdə Laçın rayonunda müxtəlif rəhbər vəzifələrdə, o cümlədən Laçın rayon prokuroru (1943-1953), Laçın rayon Milis İdarəsinin rəisi (1961-1972) işləmişdir. 1972-ci ildə podpolkovnik rütbəsində təqaüdə çıxmış, sonrakı illərdə Laçın rayon Aqrar Sənaye Birliyində hüquq məsləhətçisi işləmişdir. 2002-ci ilin dekabrında Bakı şəhərində vəfat etmişdir.

Anası Həsənova Səriyyə Məhəmməd qızı 1919-cu ildə indiki Qubadlı rayonunun Həzərli kəndində kəndli ailəsində anadan olmuşdur. Evdar qadın olmuş, 2008-ci ilin dekabrında Bakı şəhərində vəfat etmişdir.



Həsənov Oqtay Hüseyn oğlu 1956-cı ildə Laçın şəhər 1 №li orta məktəbini bitirmişdir. 1962-ci ildə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) geoloji-coğrafi fakültəsinin coğrafiya şöbəsini əyani bitirmişdir. 1962-1978-ci illərdə Laçın şəhər 1№li orta məktəbində müəllim, tədris işləri üzrə direktor müavini işləmişdir. 1978-1982-ci illərdə Laçın rayon Partiya Komitəsində siyasi maarif kabinetinin müdiri, 1982-1991-ci illərdə Laçın rayon Xalq Nəzarəti Komitəsinin sədri, 1991-1995-ci illərdə Laçın rayon Xalq Deputatları Soveti Rəyasət Heyəti sədrinin müavini vəzifəsində çalışmışdır. 1996-cı ildən 2011-ci ilə kimi Laçın rayon Təhsil Şöbəsində metodist vəzifəsində işləmişdir.

1974-cü ildə "Azərbaycan SSR Qabaqcıl Maarif Xadimi" nişanı ilə, 1976-cı ildə "Şərəf nişanı" ordeni ilə, 1991-ci ildə "SSRİ Xalq Nəzarəti orqanlarında fəal işinə görə" nişanı ilə təltif olunmuşdur. 2009-cu ildə Azərbaycan Respublikası Prezidentinin fərmanı ilə "Tərəqqi" medalına layiq görülmüşdür.

Oqtay Həsənov 2007-ci ildə çap olunan "Hamı üçün kitab" adlı əsərin müəllifidir.

1967-ci ildə ailə həyatı qurmuşdur. 3 oğlu, 1 qızı var. 2012-ci il iyulun 21-də uzun sürən xəstəlikdən sonra 74 yaşında Bakı şəhərində vəfat etmişdir.

**POEZİYA**

Elnur İRƏVANLI



## HƏQİQƏT RUHUMDU, YALAN CANIMDI

Geniş aç qolunu, ana torpağım,
Ən əziz övladın, balan canımdı.
Çölündə çiçəktək qönçələnən gül
İçində saralıb solan canımdı.

Yaşamaq savabdı, yaşamaq günah,
Yıxdı evimizi "Allaha pənah".
Ömür qatarında hər axşam, sabah
Gedən günlərimdi, qalan canımdı.

Elnur, hamı bunu düşünmür məgər?
Bəşər haqq deməsə himindən çökər.
Cənnət-cəhənnəmə inansaq əgər,
Həqiqət ruhumdu, yalan canımdı.

## SÖZ ŞAİRƏ QƏNİM OLUR

Bu dünyanın nə dərdi var,
Hamsı hər gün mənim olur.
Ürək qəmdən su içəndə
Saçımda çox dənim olur.

Ağlar könül gülməyəndə,
İlham küsüb gəlməyəndə.
Yazıb-poza bilməyəndə
Söz şairə qənim olur.

Heca uzun, bölgü rəndə,
Cala görüm bəndi bəndə.
Yazmayanda sözlərdən də
İnciyib küsənim olur.

## MƏN NİYƏ VƏDƏSİZ QOCALIM, ALLAH

Qarabağ yurdumun zərli tacıydı,
Gedibdi, hayandan tac alım, Allah?
Düşmənim hiyləgər, millətim fağır,
Necə öz başıma bac alım, Allah?

Tərtərtək çağlayıb axmıramsa mən,
Gorusdan Qafana baxmıramsa mən.
Şuşa qalasına çıxmıramsa mən,
Necə qürrələnim, ucalım, Allah?

Qapqara saçımız qırov içində,
Dağları gizlədib Murov içində.
Gözümün önündə alov içində
Yandı Kəlbəcərim, Xocalım, Allah!

Babam – Yurd uçurma, yurdu qur,-deyib
Döyüşə - silahlan, hazır dur, - deyib.
"Göyçə" haraylayıb, "Zəngəzur" deyib,
Mən niyə vədəsiz qocalım, Allah?!

## AXTAR BABALARI



### DAŞDILI HÜSEYN OĞLU ABDULƏLİ

Atam Abduləli Hüseyn oğlu Qələndərov 1879-cu ildə Zəngəzur mahalının (indiki Laçın rayonu) Daşlı kəndində anadan olmuşdur. Atası Qələndəroğlu Hüseyn Zəngəzur və Qarabağ mahalında varlı, sayılıb-seçilən el ağsaqqalı kimi tanınırdı.

Abduləli 10 yaşınadək Molla Əzizdən dərs alaraq ərəb dilini öyrənmiş, 10 yaşına çatanda Şuşada realnı məktəbə qəbul olunmuşdur. Buranı bitirdikdən sonra gənc Abduləli Gəncə Gimnaziyasında təhsilini davam etdirir. Ali təhsilini isə Tiflisdə alaraq "Təbiəti mühafizə və meşəçilik" ixtisasına yiyələnir. Ali təhsilini başa vuraraq Şuşaya qayıdan Abduləli Qələndərov Qarabağ qubernatorluğunda işə düzəlir. O, rus, ərəb və fars dillərini mükəmməl bildiyinə görə knyaz Baryatinskinin köməkçisi və tərcüməçisi vəzifəsində çalışıb.

Yeri gəlmişkən, atamın xatirələrindən yadımda qalanları diqqətinizə çatdırmaq istəyirəm. Həmin xatirələrdə o dövrün ictimai-siyasi hadisələrinin bəzi məqamları da öz əksini tapıb. Əminəm ki, jurnalın oxucuları üçün də maraqlı olar.

**Atamın dediklərindən:**

***SULTAN BƏYLƏ İLK TANIŞLIQ***

Mən Şuşada realnı məktəbdə oxuyanda maddi cəhətdən korluq çəkmirdim. Evdən yağ, pendir və bal gətirirdim. Başqa ərzaqları da bazardan alırdım. Pulum həmişə olurdu, qurtarsa da atamın yaxşı tanıdığım bir neçə dostundan ala bilərdim. Unudulmaz müəllimim Əbdürrəhim bəy Haqverdiyev həmişə deyirdi ki, bir çətinliyin olsa məndən gizlətmə. Allah ona qəni-qəni rəhmət eləsin. Mən onun sevimli tələbələrindən biri idim.

...Novruz bayramı ərəfəsində bizi on günlüyə evə buraxdılar. Bu müddəti doğma kəndim Daşlıda keçirdim. Vaxt tamam olanda atama dedim ki, sabah Şuşaya qayıtmalıyam. Səhər tezdən durdum. Xankişi və Əmirlə birlikdə atlanıb yola düşdük. Xankişi bacım Şəhrinin həyat yoldaşı, Əmir isə Mahmud əmimin oğlu idi. Hər ikisi qoçaq adam idi.

Əmirin atının tərkində çox da ağır olmayan xurcun vardı. Xurcunun bir tayına günorta və axşam yeməyi, o biri tayına isə bir sərnic bal qoyulmuşdu.

Əmirin belində kazak beşatılanı, toqqasında xəncər var idi. Xankişinin əlində mauzer tüfəngi, mənim üstümdə yaraşıqlı xəncər vardı. Hər üçümüz gülə-gülə yol gedirdik.

Hava buludlu idi. Gecə yağış yağmışdı. Təxminən bir saat yol getdikdən sonra Muncuqlu çayına çatdıq. Dağlara bərk yağdığından çay daşmışdı. Çaydan keçməyə bir az tərəddüd etdik. Xankişi bizdən böyük olduğu üçün qərarı o verməli idi. Xankişi Əmirə dedi ki, atı vur çaya. Əmir "ya Allah" deyib atı vurdu çaya. Su atın qarnından bir az yuxarı qalxsa da, salamat o taya keçdilər. Xankişi mənə dedi ki, indi sən keç. Çayın o tayında da Əmir bərkdən çığırırdı ki, qorxma, atın üstündə möhkəm dur. Əmirin səsinə çayın o tayına iki atlı da gəldi. Mən atı çaya vuranda o atlılar da Əmirlə bərabər çayın qırağına yaxınlaşdılar. Çayın ortasında su az qalırdı ki, xrom çəkmələrdən içəri dolsun. Atın qabağı ilə su iri daşları da aparırdı. Çaydan çıxmağa 1-2 metr qalmış atın dal ayaqları büdrədi. Mən tez qabağa tullandım.

Əmir və yanındakı o iki adam tez suya girib məndən tutdular. Biz kənara çıxdıq. Amma onu deyim ki, at məni çayın qorxusuz yerinə çıxartmışdı. Baxdıq ki, atın dal qılçası topuqdan bir az yuxarı sınıb. Xankişi də atı vurdu çaya və rahat keçdi. Belə məsləhətləşdik ki, Xankişi məni Şuşaya aparsın.

Əmirin səs-küyünə gələn adamlar Paşa bəyin mehtərləri imiş. Onlar hadisəni Paşa bəyə danışıblar. Paşa bəy oğlu Sultana deyir ki, özün atlan, nökərlərə də tapşır ki, bir yaxşı at aparsınlar. Yəhəri o atdan alıb bu atın belinə qoysunlar. Baxdıq ki, 3-4 atlı sürətlə yanımıza gəlir. Paşa bəyin Çay evi ilə Muncuqlu çayının arası iki kilometr olardı. Gələn atlılardan biri Sultan bəy idi. Bizlə səmimi görüşdü, Allaha şükür etdi ki, salamat qurtarmısınız. Sultan bəy mənə dedi ki, bu yəhərsiz atı atam yollayıb. Nökərlər tez bizim atın yəhərini alıb gətirdikləri atın belinə qoydular.

Xosrov bəylə mən yaşıd idim. Məndən 8 yaş böyük olan Sultan bəylə ilk dəfə idi ki, görüşür, yol yoldaşı olurdum. Atları yavaş-yavaş sürür, çox səmimi söhbətləşirdik. Mənə dedi ki, indi səni ləngitməyəcəm, amma Şuşadan qayıdanda bir neçə gün bizdə qalacaqsan. Atalarımız bir-birinin xətrini çox istəyir, biz niyə dost olmayaq? Rusca da bir az zarafatlaşdıq. Çay evinə çatanda gördük ki, Paşa bəy yolun kənarı ilə gəzir. Tez atdan düşüb onunla görüşdüm, əlindən öpdüm. O da mənim alnımdan öpdü. Üzünü oğlu Sultana tutub dedi: "Hüseynin oğlu bir daş-

qın çaydan salamat qurtarıb. Hələ qabaqda bir qanlı çay – Ələkçi çayı da var. Bu nökərlərdən 3-4 nəfər qoş Abduləligilə, o çaydan da salamat keçsinlər". Sultan bəy 3 nəfər atlı adamı qoşdu bizə. Xoşbəxtlikdən Ələkçi çayı sakit axırdı. Atlılar qayıtdılar.

Qırxqız dağına sarı qalxırdıq. Düşüncələrimlə baş-başa qalmışdım. Paşa bəyin ağıllı, uzaqgörən, təmkinli və səxavətli olduğunu gördüm. Sultan bəylə qısa söhbətim məndə xoş təəssürat oyatdı. Onda heç 15 yaşım yox idi. Sultan bəyin isə 22-23 yaşı var idi. Hərəkətində və söhbətində çox qürurlu, pəhləvan cüssəli, yaraşıqlıydı.


***Kərim Qələndəroğlu***

Onu da qeyd edim ki, Sultan bəyin toyunda yaxından iştirak etmişəm. Atam Hüseynlə Paşa bəy həmsöhbət idilər. Toyda da yanaşı oturmuşdular.

Toyun padşahı (toy bəyi) əmim Qələndəroğlu Kərim idi. Kərim əmim çox şəxsiyyətli, görkəmli kişi idi. Toyları çox məharətlə idarə edirdi. Məclisin şirin yerində arada gəzəni hüzuruna çağırıb bir kasa narın üyüdülmüş burunotu verirdi. Adamlar burunotunu burunlarına çəkirdilər. Aradan az keçmiş asqırmağa başlayırdılar. 20-30 dəqiqə gülməli mənzərə alınırdı. Burunotu çəkməyənlər çəkənlərdən çox gülürdülər. Amma bu cəza kənardan gələn qonaqlara, hörmətli ağsaqqallara, hacılara, məşədilərə və seyidlərə tətbiq edilməzdi. Burunotu çəkənlər razılıq edərdilər ki, başımız açıldı, yüngülləşdik.

Kərim əmim toyda şuluqluq salanları hər iki dizin altına kələ-kötür odun qoymaqla, bir kasa inək yağı içirtməklə cəzalandırardı.

Ən maraqlısı at çapmaq yarışı idi. Kimin atı birinci yerə çıxsa, o atın boynuna ipək şal və kəlağayı yaylıq bağlayardılar. At çapmaq yarışında Mustafa əmimin oğlu Azad xüsusi fərqləndi. Azad atı çapa-çapa başı üstə dik dayandı. Hamı əhsən dedi. Bunu təkrarlayanlar oldu, amma Azad kimi edənlər olmadı. Azad təkrar olaraq atı tək çapdı. Atın tam qaçarağında sağ tərəfdən yenib sol tərəfdən yəhərin üstünə mindi. 100 nəfərə yaxın atlıdan heç kim Azadın bu hərəkətini təkrar edə bilmədi. Zəngəzurdan, Qarabağdan və digər bölgələrdən gələn qonaqlar Azadın qoçaqlığına və məharətinə əhsən dedilər. Atam Hüseyn qürurla deyirdi ki, Azad əmim oğlu Mustafanın oğludur. Azadın atına və özünə qiymətli xələtlər verdilər. Toyda biz cavanlar uzağa-yaxına yumurtanı nişangah qoyub tapança və beşatılanla atırdıq. Üç gün Sultan bəyin yanında oldum. Sultan bəyin və Xosrov bəyin 15-20 dostu bir yerdə idik. Bir neçə

aşıq dəstəsi və Şuşanın məşhur xanəndələri də toyda iştirak edirdilər. Axşamlar biz cavanlar üçün əlik (cüyür) ətindən və qızıl balıqdan xüsusi xörəklər hazırlanırdı. Sultan bəyin toyu olan vaxt mən Gəncə Gimnaziyasında oxuyurdum. Xosrov bəy də orada oxuyurdu. O, gimnaziyanı məndən iki il əvvəl qurtardı. Sultan bəy də bizdən qabaq burada oxumuşdu. Müəllimlərdən biri Sultan bəylə yerli olduğumu bilib mənə deyirdi ki, ondan yaxşı hərbçi olar. Çünki daha çox gücünə güvənirdi, bu hal isə sərkərdələrə xasdır.

### *ŞƏLVƏ DƏRƏSİNDƏN GƏLƏN DÖYÜŞÇÜLƏR*

Atam danışardı ki, Andronikin başçılıq etdiyi 30 minlik erməni-daşnak ordusu Sisyan, Gorus, Meğri və Qafan ərazisindəki Azərbaycan kəndlərini talan edib yandırmış, əhalinin bir hissəsini vəhşicəsinə qırmışdır. Salamat qalanlar Laçının kəndlərinə qaçmışdılar. Andronik Laçın ərazisindən keçərək Qarabağ erməniləri ilə birləşmək və Qarabağı talan etmək istəyirdi. Sultan bəy və qardaşı Xosrov bəy bundan xəbər tutub qabaqlayıcı tədbirlər gördülər və düşmənin məkrli planını pozdular.

Əhalini səfərbər etmək üçün Sultan bəy sayılıb-seçilən ağsaqqalları Çay evinə dəvət edir. Qələndər oğlu Hüseyni də yanına çağırtdıraraq bildirir ki, məndə dəqiq məlumat var, ermənilər hücuma hazırlaşırlar. Vaxt itirmədən tədbir görməli, silahlı dəstələr təşkil edərək döyüş təlimləri keçməliyik. Şəlvə dərəsində bu işi görməyi sənə həvalə edirəm. Nə qədər silah-sursat lazım olsa mən verəcəyəm.

Hüseyn babam bildirir ki, bəy, bu hücumdan biz də xəbərdarıq. Xeyli müddətdir ki, Zəngəzurun Bayandur kəndinin 50-yə yaxın sakini erməni hücumlarından qorunmaq üçün gəlib bizim Daşlıda məskunlaşıblar. Silah məsələsinə gəlincə, Daşlıda hər kəsin silahı var. Ancaq Şəlvə dərəsinin digər kəndlərinin əhalisinə silah lazımdır.

Yeri gəlmişkən, xatırladaq ki, Sultan bəylə Qələndər oğlu Hüseynin yaxın münasibətləri olub. Sultan bəyin atası, ədalətli və müdrik şəxsiyyət kimi yaddaşlarda yaşayan Paşa bəy deyərmiş ki, ağsaqqalların çoxu aminçidir. Amma Sultan bəy səhvə yol verəndə Qələndər oğlu Hüseyn onun nöqsanlarını deyir və çəkindirməyə çalışır.

Hüseyn yola düşməyə hazırlaşarkən Sultan bəy deyir:

– Qələndər oğlu, səndən bir xahişim də olacaq. Oğlun Abduləli qubernatorluqda işləyir. Mükəmməl təhsil alıb, rus, ərəb və fars dillərini bilir. Onunla xüsusi münasibətlərim də var. Xəbər elə təcili yanıma gəlsin. Bizim döyüşən adamlarla yanaşı, yüksək siyasi savadı olan insanlara

ehtiyacımız böyükdür. Çünki bu savaşda tərəfimizi tutan təkcə türklərdir. Ruslar, firənglər və ingilislər yenə də ermənilərin tərəfindədir.

Elə həmin gün Hüseyn əmisi nəvəsi Əmiri Şuşaya göndərir ki, Abduləlini gətirsin. İki gündən sonra Qələndər oğlu Hüseyn, qardaşları Həsən və Kərim, əmisi oğlu İsmayıl oğlu Abbas, Tağı oğlu Salah və Mustafa qardaşları öndə olmaqla Sadıq İsmayıl oğlu, Boran Abbas oğlu, Bahadur Hüseyn oğlu, Əvəz Kərim oğlu, Kərəm Həsən oğlu, Muxtar Həsən oğlu, Əmir Mahmud oğlu, Qələndər Şükür oğlu, Qaraş Şükür oğlu, Azad Mustafa oğlu, Müstəcəb Rza oğlu, Xankişi Tağı oğlu, Rza Tağı oğlu, Xanlar Tağı oğlu, Misir Cəfərqulu oğlu, Fərrux Cəfərqulu oğlu, Bəhrəm Cəfərqulu oğlu, Mütəllim Qulu oğlu, Paşa Sarı oğlu (Qovuşuq kəndindən, Hüseyn kişinin qaynı), Rza Cahangir oğlu (Kaha kəndindən), Əli Məhərrəm oğlu (Şəlvə kəndindən), Zülü Əli oğlu (Şəlvə kəndindən), Əşrəf Xələf oğlu (Şəlvə kəndindən), Zalan Məmmədcəfər oğlu (Bayandur kəndindən gələn), Alı Abış oğlu (Bayandur kəndindən gələn), Ədil Abış oğlundan (Bayandur kəndindən gələn) ibarət dəstə Çay evinin qabağına gəlir. Pəhləvan cüssəli cavanları görən bəy çox sevinir, Hüseyni qucaqlayaraq bağrına basır və gələn ağsaqqallara minnətdarlığını bildirir. Elə həmin gün silahlanan dəstə döyüş təlimlərinə başlayır.

Daşlıların ilk düşərgəsi Alxaslı və Hoçaz kəndləri arasında olur. Sultan bəyin qərargahı isə Alxaslı kəndində yerləşirdi. Atasının çağırışı ilə bəyin yanına gələn Abduləli də daim bu qərargahda oturaraq mirzə vəzifəsini icra edir. Gələn məktublar, yazılı verilən tapşırıqlar, silahların verilmə siyahısı və digər məxfi sənədlər ciddi mühafizə olunan qərargahda xüsusi yerdə, Abduləli Hüseyn oğlunun nəzarəti altında saxlanarmış.

Məşhur "Zabux" əməliyyatının uğurla keçirilməsində Qələndər oğlu Kərimin başçılıq etdiyi Daşlıdan gələn döyüşçülərin də böyük rolu olub. Sonuncu döyüşə qədər gecələr bir neçə dəfə erməni mövqelərinə hücum edən daşlılar erməni silahlılarını məhv etmiş, bir neçə erməni quldurunu girov götürmüş, xeyli sayda silah-sursat, at, qatır və ərzaq gətirərək öz səngərlərində mövqelərini möhkəmləndirmişlər.

Döyüşlərin əvvəlindən axırınadək iştirak etmiş, 1982-ci ildə 92 yaşında dünyasını dəyişən əmim Bahadur Hüseyn oğlu Qələndərovun dediklərindən: "Erməni-müsəlman savaşında mənim 26 yaşım var idi. Hər gün təlimlər keçir, ermənilərin hücumunu gözləyirdik. Sultan bəy at belində silahlıların təlim keçdikləri yerləri gəzir, müvafiq tapşırıq və göstərişlər verirdi. Bir gecə əmim oğlanları Sadıq və Kərim kəşfiyyata getdilər. Qayıdanda xəbər gətirdilər ki, kəndin yaxınlığında erməni silahlıları düşərgə salıblar. Səhəri gün 15 nəfər həmin düşərgəyə doğru getdik.

Gecədən az keçmiş düşərgəni üç tərəfdən mühasirəyə aldıq və eyni vaxtda atəş açdıq. Bir saata qədər şiddətli atışmada xeyli sayda erməni silahlısı məhv edildi. Yaxınlıqda yeraltı kaha var imiş. Sağ qalanlar qaçıb orada gizləndilər. 3 nəfər erməni, 7 ədəd beşatılan tüfəng, 4 at, 2 qatır qənimət götürərək öz mövqelərimizə qayıtdıq. Bizdən heç kəsə xətər toxunmamışdı.

Belə gecə əməliyyatlarını bir neçə dəfə etdik.

Bir gecə Sadıq, Kərəm, Boran, Xankişi və mən erməni düşərgəsinin lap yaxınlığınacan irəlilədik. İki erməni söhbət edirdi. Qəflətən onları tutduq və gətirib bəyə təhvil verdik. Bir gecə isə bir erməni, 14 baş mal gətirdik. Həmin ermənilərdən çox şey öyrənən Sultan bəy dedi: "Daşdılılar, həqiqətən siz igid adamlarsınız, gecələr əjdahaya dönürsünüz."

Daşdılıların ən ağır döyüşü Keçəldağda olub. Həmin döyüşdə Qələndər Şükür oğlu, Muxtar Həsən oğlu və Azad Mustafa oğlu yaralandılar. Şəlvə kəndindən Əşrəf Xələf oğlu şəhid oldu. Əşrəf atam Hüseynin bacısı qızının yoldaşı idi. Axşamüstü döyüşdən sonra biz geri çəkiləndə məlum oldu ki, Əşrəf yoxdur. Daşdılılara başçılıq edən Kərim dedi ki, gecə də olsa Əşrəfi tapmalısınız. On nəfərdən çox adam geri qayıtdıq. Bir çox meyitlərə baxdıq. Kərəmlə Sadıq "tıqqıltı" işarəsi ilə bizi çağırdılar. Gedib gördük ki, Əşrəfin meyitini tapıblar, ancaq başı yoxdur. Əşrəfin meyitini Minkəndə gətirdik. Oradan da bir neçə adam Şəlvə qəbiristanlığına apardı. Əşrəf çox irigövdəli adam idi. Biz döyüş ərazisindən geri çəkiləndə ermənilər ölənlərin silah və paltarlarını aparmağa gəlirlər. Əşrəfin meyitini Sultan bəyin qardaşı İsgəndər bəyə oxşadırlar. Əşrəfin başını aparırlar ki, mükafat alsınlar.

Keçəldağ döyüşlərində Şəlvə dərəsindən gələn dəstə böyük igidlik göstərdi. Bizim döyüşçüləri gündəlik yeməklə Minkənddən olan Hacı Vəli təmin edirdi."

Savaş dövründə, xüsusən də 1917-1918-ci illərdə atam Sultan bəylə bir yerdə olub. Sultan bəyin müharibə vaxtı ən gizli söhbəti Seyid Həmidlə olarmış. Onda da atamı yanında saxlayarmış. Çünki Seyid Həmidlə anam Sədəfin qohum olduğunu bilirdi. Seyid Həmid çox qorxmaz, igid adam idi. Həmişə atama tapşırarmış ki, verilən silahların siyahısını dəqiq tutsun, sonra nanəcib adamlar danarlar.

Ermənilər Zabux dərəsində ağır məğlubiyyətə uğradıqdan sonra müəyyən müddətə sakitlik yaranıb. Zabux kəndi və Dığ kəndi sərhədində, Zabuxun düzü adlanan yerdə rusların və ingilislərin təkidi və iştirakı ilə imzalanan "Sülh müqaviləsi"ni atam Abduləli yazıb hazırlayıb və Sultan bəy də möhür basıb (Təəssüf ki, indi həmin müqavilə əldə yoxdur).

Anam danışardı ki, sovet hakimiyyəti gələndə malımızı-mülkümüzü aldılar, evimizin qiymətli əşyalarını götürdülər, nəslimizi isə mülkədar-qolçomaq adlandırdılar. Qorxudan evdə olan kağızları yandırdım. Çox güman ki, həmin müqavilə də o zaman məhv edilib.

Şuşa qəzasında sovet hakimiyyəti qurulduqdan sonra Qəza Komitəsinin I katibi işləyən Ocaqqulu Musayev tərəfindən atam Qəza İcraiyyə Komitəsinin sədri vəzifəsinə təyin edilir. Bir müddət sonra atamı mülkədar ailəsindən olub, Sultan bəylə işləməkdə günahlandıraraq vəzifədən uzaqlaşdırırlar (Bu zaman O.Musayev Gorusda partiya katibi kimi fəaliyyət göstərirdi. Təəssüf ki, çox keçmədən ermənilər onu da qətlə yetirdilər). Bu zaman atamın tələbə yoldaşı və dostu olan şuşalı Zülfüqar bəy Mədət bəy oğlu işə qarışır. O, tanıdığı, Şuşaya yeni təyin olunan partiya katibini inandırır ki, Abduləli təmiz adamdır, bir neçə əcnəbi dil bilir. O.Musayevlə dost olub və hər zaman ona kömək edib.

Bundan sonra atamı indiki Qubadlı, Laçın və Zəngilan rayonlarını əhatə edən Qəza Meşə Təsərrüfatı idarəsinə müdir təyin edirlər. Atam o illəri belə xatırlayırdı:

### *KƏLBƏCƏRDƏ KEÇƏN İLLƏR*

"“Zabux əməliyyatı”nda ermənilərin ağır itki verib məğlub olması bizi arxayınlaşdırmadı. Sultan bəy sərhəd boyu yerləşən döyüşçülərə öz mövqelərində möhkəm dayanmağı tapşırdı. Amma əsas narahatçılıq Kəlbəcər tərəfdən idi. Ermənilər Göyçə və Basarkeçər tərəfdən hücuma keçə bilərdilər. Sultan bəy mənə dedi ki, Kəlbəcərdən olan ağıllı, qoçaq və imkanlı adamları dəvət edək və onlarla məsləhətləşib birgə fəaliyyət göstərək.

Bəyin tövsiyəsi ilə hazırladığım məktub onlara çatan kimi Məşədi Cəmil, Kürdoğlu Məhəmməd, Süleyman bəy, Babaxan, Zeynalabdin və başqaları Alxaslı kəndindəki qərargaha gəldilər. Həmin gün Laçın kəndlərinin imkanlı və dəyərli ağsaqqalları da gəlmişdilər. Bu görüş çox xoşməramlı görüş idi. Kəlbəcərlilər və laçınlılar biri-birinə əmioğlu, qardaş deyə müraciət edirdilər. Sultan bəy üzünü kəlbəcərlilərə tutub dedi: “Siz də öz sərhədlərinizdə möhkəm müdafiə qurun, əhalini silahlandırın. Hələlik 50 ədəd beşatılan tüfəng və çatacaq qədər patron aparın.”

Səhər tezdən xəbər gəldi ki, ermənilər Cağazur və Fərəcan kəndlərinə hücum edib və ağır itki verərək geri çəkiliblər. Cağazurlu Ağaməmmədin dəstəsi çox igidlik göstərib. Xəbər Sultan bəyə çatan kimi atlandı. Qurdqajılı Abdulxaliqlə mənə tapşırdı ki, silahları Məşədi Cəmilgilə təhvil verin. Biz də “təhvil-təslim” aktı ilə silahları payladıq.

Kürdoğlu Məhəmməd xahiş etdi ki, beşatılanın ikisinin yerinə iki ədəd türk mauzeri verin, çünki o tüfəng çox uzağı vurur və patronları dağıdıcıdır. Razılaşdıq və bildirdik ki, mauzerin patronu azdır. Məhəmməd dedi ki, bizdə o patrondan çoxdur. Onlar 48 ədəd beşatılan tüfəng, 2 mauzer və 2 qatır yükü patron götürüb yola düşdülər.

...Mən Kəlbəcərdə işə başlayanda ən əvvəl Kürdoğlu Məhəmməd yanıma gələrək bildirdi ki, Sultan bəylə sənin yaxşılığını unutmamışam və nə kömək lazımdırsa edəcəm. O, yaxşılıq deyəndə ona iki türk mauzerinin verilməsini nəzərdə tuturdu. Sonrakı günlərdə Qazıxanlıdan Süleyman bəy, Kəlbəcərdən Hacı Şirin oğlu Museyib, Keştəkdən Babaxan, Başlıbeldən Zeynalabdin, Zəylikdən Molla Musa oğlu Saleh və başqaları gəlib məni təbrik edir, hər cür köməklik göstərməyə hazır olduqlarını deyirdilər.

Kürdoğlu Məhəmməd Kəlbəcərdə üsyan edəndə kommunist partiyası katibinin evini və başqa yeni hökumət binalarını dağıtdı, 3 ayadək hakimiyyəti əlində saxladı. Meşə idarəsinə tərəf bir addım da atmadı. Hacı Şirin oğlu Museyib mənə dedi ki, Kürdoğlu Daşdılı Abduləlinin idarəsinə dəyməməyi tapşırıb. Museyib onu da dedi ki, Sultan bəyin silahdaşı olduğunu hamı bilir, ona görə də başın ağrıyacaq.

Üsyan yatırıldıqdan sonra sovet milis dəstələri və digər silahlı birləşmələr Kürdoğlu Məhəmmədin adamlarını tərksilah etdilər. Məni yenə də NKVD-iyə çağırıb sorğu-sual elədilər. Məhəmmədlə əlaqəmin olmadığını dedim. Sağ olsun Kəlbəcərin ədalətli və uzaqgörən adamları, məni müdafiə etdilər. Bakıdan gələn təhlükəsizlik komitəsinin bir nəfər işçisi rus millətindən idi. Məni axırıncı o danışdırdı. Bizə tərcüməçi lazım olmadı. Ona düzünü danışdım, Sultan bəyin İrana və ya Türkiyəyə getdiyini, onunla bir daha görüşmədiyimi bildirdim. Onunla xeyli söhbət etdik. Mənə deyirdi ki, rus xalqının tarixini, yazıçı və şairlərini yaxşı tanıyırsan. Söhbətimiz tuturdu. O, Bakıya gedəndə mənə dedi ki, öz işinlə məşğul ol, daha səni NKVD-i narahat etməyəcək.”



1941-ci ildən 1952-ci llədək Kəlbəcər rayon Meşə Təsərrüfatında müdir, baş meşəçi vəzifələrində işləyən atam Abduləli Qələndərov 1954-cü ildə 75 yaşında vəfat edib.

**Hüseyn ABDULƏLİOĞLU**

**TARİXİ HƏQİQƏT**

# AVROPA İNSAN HAQLARI MƏHKƏMƏSİNDƏ ERMƏNİSTANA QARŞI DAHA BİR MƏHKƏMƏ İDDİASI QALDIRILDI

Ermənistan hökuməti Rus ordusunun köməyi ilə 1992-1993-cü illərdə Azərbaycan torpaqlarının 20%-ni işğal edərək Dağlıq Qarabağ və ətraf ərazilərdəki Azərbaycanın inanc yerləri və dini abidələri dağıdıldıqdan sonra salamat qalan digər milli-mədəni dəyərlərinin erməniləşdirilməsi işinə başlandı. Belə ki, işğal altındakı ərazilərdən yüz mindən çox eksponat əvvəlcə Ermənistana, oradan isə satış məqsədi ilə digər dövlətlərə aparıldı. Bu eksponatların çox az bir qismi Hadrut, Xankəndi, Martuni, Əsgəran, Ağdərə və Laçın şəhərlərində yenidən təşkil edilmiş muzeylərdə sərgiyə qoyuldu.

Bütün bu muzeylərdə sərgiyə qoyulan Azərbaycan xalqına məxsus milli-mədəni dəyərlər və xalq sənətkarlarının əsərləri dünyaya müxtəlif erməni adları altında, erməni xalqının milli-mədəni dəyərləri kimi təbliğ olunur.

Erməni saytlarından əldə etdiyimiz məlumatlar və görüntülər içərisində diqqətimizi çəkən Laçın rayonunun Mirik kənd sakini Rəhim Murtuzayevin müəllifi olduğu 2 ədəd sənət əsəri oldu. Bundan dərhal sonra Azərbaycanın İşğal Olunmuş Ərazilərindəki Tarix və Mədəniyyət Abidələrini Müdafiə Təşkilatı ictimai birliyinin əməkdaşları tədqiqata başladılar. Tədqiqat nəticəsində məlum oldu ki, Rəhim Murtuzayevin bütün əl işləri haqqında məlumatlar və görüntülər 1980-ci illərin dövri mətbuatında kifayət qədər işıqlandırılmışdır. Rəhim Murtuzayevin öz saxlancında gəzdirdiyi sənədlər və şahid ifadələri vətəndaşın işğal altında qalmış bu əl işləri üzərində müəlliflik hüququnun olduğunu tamamilə təsdiq edir. Bu əsərlər eyni zamanda Azərbaycanın milli-mədəni dəyərləri hesab olunur.

Rəhim Murtuzayev Laçın rayonunun Mirik kəndində anadan olmuş, 1992-ci ilin may ayına qədər orada yaşamışdır. Onun əsas fəaliyyəti yerli daşlardan müxtəlif məişət əşyaları (su novu, bardaq, bulaqların inşasında istifadə olunan bədii daşlar və s.), eyni zamanda insan fiqurları və barelyeflər yonub düzəltmək olmuşdur. Onun sənəti həmyerliləri tərəfindən sevilərək həmişə yüksək qiymətləndirilmiş və bəyənilmişdir. R.Murtuzayevin əl işlərinin inkişafı üçün yaşadığı rayonun icra strukturları tərəfindən ona daim qayğı göstərilmişdir.

Rəhim Murtuzayevin əl işləri özünəməxsusluğu ilə fərqlənmiş, o heç kimi təqlid etməmiş, əsərlərini kiminsə əsərlərinin bənzəri kimi yaratmamışdır. Onun əsərlərinin süjet xətti Azərbaycan xalq nağıllarına və Azərbaycanın yazıçı və şairlərinin əsərlərinə illüstrasiya xarakteri daşıyır. Ümumiyyətlə, bu əsərlərin yaranması bütünlüklə Azərbaycanın milli-mədəni dəyərlərindən qaynaqlanmışdır. Rəhim Murtuzayevin əsərlərinin analoqu nə Azərbaycan Respublikasında, nə də digər ölkələrdə yoxdur.



Rəhim Murtuzayevin əsərləri haqqında məlumatlar və onun əsərlərinin görüntüləri Azərbaycanda nəşr olunan bir çox qəzet və jurnallarda, o cümlədən Sovet dövrü Laçın rayonunda nəşr olunan “Laçın” qəzetinin 13 iyul 1989-cu il tarixli sayında (№78) dərc olunmuşdur.

1992-ci il işğalından dərhal sonra Ermənistan dövlət rəhbərlərinin göstərişi ilə işğal edilmiş Azərbaycan ərazilərindəki inzibati yaşayış mərkəzlərindən Azərbaycan xalqına məxsus muzey eksponatları və digər bədii nümunələr toplanaraq Laçın şəhərinin mərkəzində, 1992-ci ilin may ayına qədər azərbaycanlılar tərəfindən inşa edilmiş Univermaq binasında muzey yaratmaq haqqında qərar verildi. Ermənilər bu materialları toplayarkən Mirik kəndindən R.Murtuzayevin Azərbaycanın xalq qəhrəmanı Cavidana, “Fərhad və Şirin” əsərinə ithaf etdiyi barelyefləri də götürərək bu binaya gətirdilər və burada sərgiyə qoydular.

Bununla da Ermənistan Respublikası "Silahlı münaqişə baş verdikdə mədəni dəyərlərin qorunması haqqında" 1954-cü il Haaqa Konvensiyasının, "Ümumdünya mədəni və təbii irsin mühafizəsi haqqında" YUNESKO-nun 1972-ci il konvensiyasının müddəalarını, eləcə də YUNESKO-nun Ali Konvensiyası tərkibinə daxil olan ölkələrə mədəni-tarixi dəyərlərin qorunması haqqında tövsiyələrindən (1972-ci il) irəli gələn tələbləri pozmuşdur.



Bu məsələ ilə bağlı Azərbaycanın İşğal Olunmuş Ərazilərindəki Tarix və Mədəniyyət Abidələrini Müdafiə Təş-

kilatı ictimai birliyinin sədri Faiq İsmayılovun rəhbərliyi ilə, Azərbaycan Respublikası Prezidenti Yanında Qeyri-Hökumət Təşkilatlarına Dövlət Dəstəyi Şurasının vəsaiti hesabına 25 avqust 2012-ci il tarixdə Avropa İnsan Haqları Məhkəməsində Ermənistana qarşı məhkəmə iddiası qaldırıldı.

**Mətbuat xidməti**
**Əlaqə telefonları:**
(055) 639-26-19; (055) 902-27-81

## LAÇIN TƏBİƏTİ

## ŞƏLVƏ ÇAYI

Bol su ehtiyatlarına malik olan Şəlvə çayı Laçın rayonunun ərazisindən axır. Çay Minkənd çayı ilə birləşərək Həkəri çayını (uzunluğu 113 km) yaradır ki, bu çay da Araz çayına qovuşur.

Şəlvə çayının uzunluğu 42 km, hövzəsinin sahəsi 582 km$^2$-dir, çay Mıxtökən silsiləsindən (2580 m hündürlükdən) başlanır. Hocazsu çayı ilə birləşərək Həkəri çayını əmələ gətirir. Əsasən yeraltı sularla (62%) qidalanır. Suvarmada istifadə edilir.

**Mənbə: ASE, X cild. Bakı, 1987. səh.505.**



**BİZƏ YAZIRLAR**

## HÖRMƏTLİ REDAKSİYA!


*İlyas İbrahimov*

Sizə böyük bir missiyanı yerinə yetirdiyinizə görə təşəkkür edirəm. Siz "Laçın yurdu" jurnalını çap etməklə çox böyük bir iş görmüsünüz. Bu jurnal neçə illərdir ki, pərən-pərən düşüb bir-birindən xəbər ala bilməyən yurddaşlarımızı öz səhifələrində "qovuşdurur". Sizə bu çətin və məsuliyyətli işinizdə uğurlar diləyirəm.

Mən həyatdan vaxtsız gedən nakam şair İlyas İbrahimovun övladı kimi sizin redaksiyanıza təşəkkür edirəm ki, onun bir neçə şeirinin və haqqında xatirə-məqalələrin çap olunmasına şərait yaratmısınız. Onun yarımçıq ömrünü məqalələrində əks etdirib küskün ruhunu sevindirən tanınmış jurnalistlər Əsgər Əsgərova və Şöhlət Abbasa ömrümün sonunadək minnətdaram. Qoy zehinləri açıq, qələmləri iti, yazan əlləri var olsun.


*Məhəmməd Səyyah*

Amma, mənim sizə müraciətimin başqa bir səbəbi də var. Sizin jurnalın keçən saylarının birində çox keşməkeşli həyat yaşamış Laçın elinin istedadlı şair oğlu Məhəmməd Səyyah haqqında məlumat və şeirini oxudum. Çox mütəəssir oldum. Çünki o, atamın ən sədaqətli dostlarından biri idi. Mənim də onunla bağlı xatirəm var.

Dörd-beş yaşım olardı. Qarlı qış günü idi, babamla nənəm atamın qəbrini ziyarətə getmişdilər. Anam isə nədənsə dayımgilə getmişdi. O zaman qapımız döyüldü, biz darvazanı açdıq. Gələnlər bir kişi və bir qadın idi. Onlar atla gəlmişdilər. Eşmə bığlı, nurlu sifətli kişi başımı sığallayıb üzümdən öpdü. Evdə böyüklərin olmadığını bilib məni onları çağırmağa göndərdi. Məni bu sözlərlə yola saldı: – Qızım, get anana de ki, bizə bir əmi gəlib. O həm şair, həm ovçu, həm də səyyahdır. Gələnin Məhəmməd Səyyah olduğunu bilən kimi anamla birgə dayım da bizə gəldi. Bundan xəbər tutan qohumlar, yaxın qonşular hamısı bizə yığışdı. Gecə yarısına kimi o, şeir söylədi, atamla bağlı xatirələrindən danışdı. O, sonralar da bizə gələrdi, yaxın dostunun ailəsini, uşaqlarını unutmazdı, yad edərdi. Yenə bir qarlı fevral günü o, gül

əklili düzəltdirib atamın qəbrini ziyarətə gəlir. Geri qayıdanda onu evlərinə dəvət etmiş kəndlilər olur. Səyyah bu dəvətləri qəbul etməyib: – “Mən İlyasın qəbrini ziyarətə gəlmişdim sadəcə, indisə geri dönürəm” deyib. Əklilin üzərində bu sözləri yazdırmışdı: “Zər qədrini zərgər bilər.”

Mən onu gözəl bir insan, istedadlı şair, ən əsası isə atamın ən sədaqətli dostu kimi xatırlayır, ruhuna dualar edirəm. Səyyahın bir şeirini və atamın ona həsr etdiyi bir şeiri sizə göndərirəm. Uyğun bilsəniz çap edərsiniz.

**Hörmətlə: Təranə İBRAHİMOVA**

**DÜNYA**

Kimini salırsan dərəyə, dağa,
Sən ey isti, soyuq-havalı dünya.
Kiminin ehtiyac bükür belini,
Kimisinin başı havalı, dünya.

Baxıram, görünür Hoçaz qayası,
Saxlanır qəlbimdə mərdlərin yası.
Aldın təvazökar şair İlyası,
Qismət etdin vaxtsız zavalı, dünya.

Kimini elindən didərgin saldın,
Kiminin muradın əlindən aldın.
Heç öyünmə, bayquş kimi tək qaldın,
Səyyah dayın sənlə davalı, dünya.

**SƏNİ**

Səyyah, görürəm ki, bu çərxi-fələk
Qoyub qəm oxuna nişanə səni.
Qəzanın-qədərin qanlı əlləri
Atıb zindanlardan zindana səni.

Xəyalın daima eyləyər pərvaz,
Dövrani-gərdişlə deyilsən dəmsaz.
Dərdli danışanı dəli danışmaz,
Çaldırar bir torba samana səni.

Günəştək təmizdir, safdır xəyalın,
Səndə cavabı var neçə sualın.
Kim deyir cəm deyil əqli-kamalın?!-
Divanələr sanar divanə səni.

Yüksəlməzsən, çünki yaltaq dilin yox,
Məhv olarsan, fırıldağın, felin yox.
Rüşvət verib, rüşvət alan əlin yox,
A yazıq, sevərmi zəmanə səni?!

**KİMLƏR KEÇDİ BU DÜNYADAN**

## HƏZİ HƏSƏNOV



***Həzi və Meyxanım Həsənovlar. 1943***

Həsənov Həzi Cəfər oğlu 1913-cü ildə Laçın rayonunun Qızılca kəndində anadan olmuşdur. İbtidai və səkkizillik təhsil aldıqdan sonra təhsilini davam etdirmək üçün rayon mərkəzinə gəlmiş, tam orta təhsilini burada başa vurmuşdur.

1937-ci ildə Laçın rayonunda komsomol işinə başlayan Həzi Həsənov sonralar rayon komsomol komitəsində şöbə müdiri, katib və II katib vəzifələrinə irəli çəkilmişdir.

1937-ci ildə Qızılca kənd sakini Həsənova Meyxanım Əkbər qızı ilə ailə həyatı qurmuşdur. Bu ailənin dörd övladı olmuş və onlar da rayonun müxtəlif işlərində çalışmışlar.

Onun həyat yoldaşı Meyxanım Həsənova pedaqoji təhsil almış, əvvəlcə Qızılcada ibtidai sinif müəllimi, sonralar isə rayonda şəhər sovetinin katibi, müharibə illərində (1941-1945-ci illər) isə Laçın şəhər soveti sədrinin müavini və VVAQ şöbəsinin müdiri vəzifələrində çalışmışdır. Müharibədən sonra 1961-ci ilə qədər Laçın Rayon Rabitə Qovşağında şöbə müdiri işləmişdir. Meyxanımın qardaşı Əkbərov Musa Əkbər oğlu isə Laçında ilk ali təhsilli riyaziyyat müəllimi kimi 30-40-cı illər arasında müəllimliklə məşğul olmuşdur.

Həzi Həsənov müharibə başlayarkən rayon komsomol komitəsinin katibi kimi könüllü olaraq cəbhəyə getmişdir. Tiflis şəhərində 6 aylıq zabit kursunu bitirdikdən sonra 416-cı Taqanroq milli diviziyasının tərkibində Mazdokdan Vyanaya qədər çox şərəfli döyüş yolu keçmişdir. O, döyüşdə 6 dəfə müxtəlif yaralar almış və ömrünün sonuna kimi II qrup müharibə əlili statusu ilə partiya və digər rəhbər işlərdə çalışmışdı. O, müharibədə 12 medala, I, II dərəcəli Vətən müharibəsi ordeninə, "Suvorov" və "Kutuzov" ordenlərinə, Balaton gölünün ətrafındakı döyüşlərə görə isə Ali Baş Komandanın xüsusi "Fəxri Fərmanı" və "Şərəf" ordeninə layiq görülmüş, 1946-cı ildə kapitan kimi ehtiyata buraxılmışdır.

Müharibə qurtardıqdan sonra, yəni 1946-cı ildən yenidən komsomol komitəsinin katibi kimi fəaliyyətə başlamışdır. Sonralar rayon partiya komitəsinin təlimatçısı, şöbə müdiri, III katib, II katib kürsüsünə qədər yüksəlmişdir. Hətta 50-ci illərdə rayonun birinci katibi uzun müddət xəstə olduğundan 8 ay müddətinə onu əvəz etmişdir.

50-ci illərdə iki dəfə Ali Partiya Məktəbində (əvvəl 2 illik, sonra isə 3 illik) sonralar rayonda rəhbər işlərdə işləmiş Muradxan Cabbarov və Xıdır Bəylərovla birlikdə təhsil almışdır.

1963-cü ildən ömrünün sonuna kimi (30.10.1981) Laçın rayon mədəniyyət şöbəsinin müdiri kimi fəaliyyət göstərmiş və dəfələrlə rayon sovetinin deputatı və Laçın Rayon Partiya Komitəsinin plenum üzvü seçilmişdir. Həzi Həsənov rayonun ictimai işlərində yaxından iştirak etmiş, rayonda mədəniyyətin və incəsənətin çiçəklənməsinə böyük köməklik göstərmişdir.

Yaxşı şahmat oynayırdı. Təsadüfi deyil ki, onun böyük oğlu Həsənov Vladimir Həzi oğlu 70-ci illərdə Azərbaycan Politexnik İnstitutunun şahmat birinciliyində II yeri tutmuşdur. Şahmat üzrə ustalığa namizəd normasını ilk dəfə laçınlılar arasında o, yerinə yetirmişdir. Kiçik oğlu Həsənov Elşən Həzi oğlu rayonda çox tanınmış tar və gitara ifaçısıdır. Onun tələbələri respublika birinciliklərində dəfələrlə mükafatlara layiq görülmüşlər.



***H.Həsənov, K.Əliyev və R.Əfəndiyev***

Həsənov Həzi Cəfər oğlu olduqca maraqlı şəxsiyyət olmuşdur. 50-ci illərdən başlayaraq arıçılıqla məşğul olmuş və onun bu sənəti öyrətdiyi insanlar sonralar arıçılığı daha da inkişaf etdirmişlər. Hətta ətraf rayonlarda da bu sahənin öyrənilməsində və inkişaf etdirilməsində Həzi Həsənovun çox böyük xidmətləri olmuşdur.

Qan təzyiqi xəstəliyindən əziyyət çəkdiyinə görə (müharibədə aldığı zədələrdən) ovçuluğa meyl salmışdı. O əsasən kəklik, turac, dovşan ovu ilə yalnız dövlətin qoyduğu norma əsasında müntəzəm məşğul olmuşdur.

Həsənov Həzi Cəfər oğlunun 45 illik əmək fəaliyyəti haqqında danışarkən deyə bilərik ki, o, bu illərdə heç bir neqativ hala yol verməmiş, tam halal və təmiz bir insan kimi ömür sürmüşdür. İndi də bunu rayonun yaşlı insanları təsdiq edirlər.

Həsənov Həzi Cəfər oğlu 30 oktyabr 1981-ci ildə vəfat etmişdir. Ömrünün sonuna kimi dövlətə və hökumətə sadiq bir insan kimi yaşadı. Digər həmyerlilərimiz kimi onun da qəbri erməni tapdağı altındadır. İnanırıq ki, çox yaxın vaxtlarda torpaqlarımız düşmən tapdağından azad olacaq, narahat ruhlar öz yaxınlarına qovuşacaq.

**POEZİYA**

**Zahir ABBAS**



### DÖYÜŞƏ QAZİ GƏRƏK

Yurdun sevən ər oğlu,
Keşik çəkər nər oğlu.
Döyüş sevməz hər oğlu,
Döyüşə qazi gərək.

Baxmaz qaraya, ağa,
Çıxar özü qabağa.
Cəbhələri yarmağa,
Döyüşə qazi gərək.

O, millətin baxışı,
O, göylərin yağışı.
O, hər şeyin yaxşısı,
Döyüşə qazi gərək.

Kəssin tökülən qanı,
Dinclik onsuz de hanı?!
Ruhlandırsın hamını,
Döyüşə qazi gərək.

Məqsədə gəlmək üçün,
Məramın bilmək üçün.
Kişitək ölmək üçün
Döyüşə qazi gərək.

### SƏN GƏLMƏZ OLDUN

Keçdi, ömür keçdi yel qanadında,
Xatirə dil açdı il qanadında.
Arzular çağladı sel qanadında,
Sevgim yas saxladı, sən gəlməz oldun.

İstək azad quşsa, sonu qəfəsmiş,
Varlığın boş şeymiş, quru nəfəsmiş.
Sən demə sevməyin adi həvəsmiş,
Gözüm qan ağladı, sən gəlməz oldun.

Səni taleyimdən mən necə silim?
Qayıtmaz geriyə hər ötən ilim.
Onsuz da həyatda qonağıq, gülüm,
Yolu kim bağladı, sən gəlməz oldun?!

### QALDI

Görüşün nə yaman az çəkdi sənin,
Xəyalın yurd salıb, özümdə qaldı.
Kaş ki, sən olaydın qismətim mənim,
İstəyim yenə də gözümdə qaldı.

Alışdım odunda, yandım odunda,
Mənə rəhmi gəldi, hətta yadın da.
Sən necə var idin qaldın yadımda,
Şirin təbəssümün üzümdə qaldı.

Düşərəm arxanca ayağıyalın,
Sevgimə bir cavab de, qadan alım!
Sənə çox yaraşır o qoşa xalın,
Ruhun hər atdığım izimdə qaldı.

ŞƏHİDLƏRİMİZ

## QIRMIZI TAYOTALI OĞLAN

Vətən, torpaq yolunda şəhid olan hər hansı bir şəxs haqqında, onun keçdiyi həyat yolundan söhbət açmaq, onun ömür yolunu araşdırmaq mənim üçün nə qədər çətin və məşəqqətli bir iş olsa da, bu kövrək, olduqca şərəfli, rəşadətli anlarla zəngin olan, lakin nakam bir qəhrəman ömrünü çözmək bir o qədər önəmli yoldur.



Qeyd edim ki, şəhidlər bu dünyadan getsələr də zaman-zaman el-obanın dəyərli insanlarının xatirində yaşayarlar. Xoş o insanların halına ki, Vətən uğrunda, el-oba yolunda şəhid olmuşdur. Hər döyüşən qazi olmadığı kimi, hər ölən kəs də şəhid sayılmaz demişlər. Torpaqlarımızın azadlığı, bütövlüyü uğrunda gedən döyüşlərdə qəhrəmanlıq göstərərək öz canlarını Vətən yolunda fəda edənlər isə şəhidliyin ən ali mərtəbəsinə yüksələnlərdir. Şəhidlər bizim and yerimiz, onların getdiyi yol isə ucalığa, ölməzliyə, müqəddəsliyə, əbədiyyətə gedən işıqlı bir yoldur. Erməni təcavüzkarlarının Azərbaycan Respublikasına qarşı torpaq iddiaları ilə başlanan Qarabağ müharibəsində doğma Vətənimiz Azərbaycanın igid oğulları kimi sinəsini Vətən yolunda sipər edərək şəhid olmuş igid oğullarımızdan biri də Qasım olmuşdur.

Alxasov Qasım Ayaz oğlu 1968-ci il 12 yanvar tarixli bir gündə Laçın rayonunun Alxaslı kəndində kəndli ailəsində dünyaya göz açıb. Ailədə doqquz övlad olmuşlar – 4 qız, 5 oğul. Qasım ailənin beşinci övladı idi.

1976-cı il sentyabr ayının 1-də Qasımın həyatında yeni bir dövr – orta məktəb illəri başlandı. Oxuduğu dövr ərzində Qasım zahirən digər şagirdlərdən bir o qədər fərqlənməsə də, daxilən bir çoxlarından fərqli idi. 2 iyun 1986-cı ildə Laçın rayon hərbi komissarlığına təqdim etmək üçün Kürdhacı kənd orta məktəbindən verilmiş xasiyyətnamədən oxuyuruq: "Oxuduğu müddətdə o, məktəbin bütün ictimai işlərində fəal iştirak etmiş, özünü təşkilatçı bir şagird kimi göstərmiş, müəllim və şagird kollektivinin dərin hörmətini qazanmışdır." Bu xüsusiyyətlərlə Qasım həyatının sonrakı pillələrində – həm Rusiyada yaşadığı dövrdə, həm də Qara-

bağ müharibəsi zamanı döyüş meydanında döyüş dostları arasında çox böyük hörmət və məhəbbət qazanmışdı.

Atası Ayaz kişi (Alxasov Ayaz Qasım oğlu) Laçın rayonunun "Qızıl Ordu" adına sovxozunun fermasında zootexnik vəzifəsində, anası Ziba xala (Alxasova Ziba Qaraş qızı) isə Alxaslı kənd xəstəxanasının filialı kimi fəaliyyət göstərən tibb məntəqəsində çalışırdı. Hər iki valideyn fermada çalışanlarla birlikdə bahar gələr-gəlməz üzü yaylağa, payız fəslinin ortalarından isə qışlağa doğru köç etməsinə baxmayaraq öz övladlarının təlim-tərbiyəsinə laqeyd yanaşmamış, oxuyub orta təhsil almaları üçün əllərindən gələni əsirgəməmişlər. Elə bu səbəbdən Qasım da digər bacı-qardaşları kimi məktəb illərinin çox hissəsini Kürdhacı kənd orta məktəbində davam etdirmişdi. Ana nənəsi Qızdarbanı (Atakişiyeva Qızdarbanı Kalbalı qızı) nənənin yanında qalıb təhsil alan Qasım məktəbdə yaxşı oxumaqla yanaşı, yaxşı davranışı ilə də digər şagirdlərdən seçilirdi.

Qasım hər il yay tətilində valideynlərinin yanına – Çalbayıra, yaylağa gedərdi. Təbiət vurğunu olan Qasım yaylaqda olduğu müddət ərzində təbiəti seyr edər, çöl-çəməndə oynayar, at çapmağı və bulaq başında oturub nahar etməyi çox sevərdi. Hərdən gələcək arzuları haqqında olan fikirləri anası Ziba xala ilə bölüşən Qasım avtomobil almağı daha çox arzulayardı. Ən böyük uşaqlıq arzusu isə valideynlərinin ahıl vaxtında onların qulluğunda dayanmaq, onların qayğısını çəkmək idi.

26 iyun 1986-ci ildə Kürdhacı kənd orta məktəbinin X sinfini müvəffəq qiymətlərlə başa vuran Qasım həmin ilin payız fəslində hərbi xidmətə yollandı. Hərbi xidmət illərini Uzaq Şərqdə, Rusiya Federasiyasının sərhədləri içərisində, Primorsk diyarının mərkəzi və liman şəhəri olan Vladivostokda yerinə yetirdi. Bu illər Qasımın uşaqlıq arzularından xeyli fərqli olaraq onun taleyini Laçından, doğma el-obası Alxaslıdan, valideynlərindən çox-çox uzaqlara, "dünyanın o başına" bağladı. Hərbi xidmətini başa vurduqdan sonra Uzaq Şərqdə dənizçilik məktəbinə daxil olmuş və təhsilini müvəffəqiyyətlə başa vuraraq xarici ölkələrə üzən okean gəmilərində işə düzəlmiş, hələ gənc ikən Kubanın, Koreyanın, Yaponiyanın və digər xarici ölkələrin sularında üzmüşdü. Yaponiyaya səfəri zamanı uşaqlıq arzularının birini reallaşdırır – Yaponiya istehsalı olan qırmızı rəngli "Toyota" markalı avtomobil alır.

Vətəndən uzaqda olsa da günləri biri-birindən maraqlı, mənalı, qayğısız keçirdi. Lakin 1988-1990-cı illərdə doğma Vətəni Azərbaycanda baş verən hadisələr Qasımın qayğılarını artırdı. Altı illik ayrılıqdan sonra 1991-ci ilin iyun ayında Qasım aldığı avtomobillə doğma Vətənə – qartal yuvası Laçına dönür. Alxaslıda və digər ətraf kəndlərdə olan qohum-

əqrəba ilə görüşən Qasım onu tanıyıb-tanımayanlar arasında "Qırmızı Tayotalı oğlan" adı ilə daha çox tanındı. O, hədsiz dərəcədə istiqanlı, təmkinli, ağır təbiətli, öz ağlı ilə hərəkət edən, gözütox, olduqca inadkar olmasına baxmayaraq zarafatı sevən, mehriban, qohum-əqrəbaya qarşı yanımcıl, qeyrətli və böyük arzulu bir cavan idi. Özündən böyüklərə və kiçiklərə, yaşından asılı olmayaraq hər kəsə "Can-ciyər" – deyə müraciət edərdi.

1992-ci ilin əvvəlində isə Uzaq Şərqə doğma Vətəni Azərbaycandan gələn xəbərləri eşidən Qasımın səbri tam tükəndi. Xəyala daldıqca eli, obası – Laçında, doğma Alxaslı kəndində, Çalbayırda keçən günləri şirin xatirə kimi gözləri önündə canlandı. Qarabağın Laçın elinin yanğılı harayına çatmaq istəyi Vladivostokun Dobrovolskaya küçəsindəki 13 saylı binanın 41-ci mənzilində (şəxsi evində) yaşayan Qasımın ən böyük arzusuna çevrildi. Vətənsə uzaqda, çox-çox uzaqda, əlçatmaz, ünyetməz bir yer idi.

Artıq xeyli vaxt idi ki, Qasım Qarabağ, Laçın həsrəti, Qarabağa, Laçına qayıtmaq arzusu ilə yaşayırdı. Ata-baba yurdunda düşmənin meydan sulayıb, at oynatmasını qeyrətinə sığışdırmırdı. Qəlbi "qisas" eşqilə döyünür, bütün varlığı ilə Vətənin müsəlləh əsgəri olmaq istəyirdi. Bu, onun ən böyük arzusu idi. Qarabağ yarası dərinə işlədikcə, biri-birindən bəd xəbərlər Odlar Yurdundan Uzaq Şərqə yol aldıqca Qasım özünə yer tapa bilmir, qəlbində düşmənə qarşı qəzəb və hiddət hissləri artır, tez-tez öz eloğullarına deyirdi ki, gəlin Qarabağa gedək, bəsdir bu alçaqlar el-obamızı incitdilər.

Günlər ötdükcə Qarabağa qayıtmaq arzusu Qasımın rahatlığını əlindən alırdı. 1992-ci il iyun ayının axırlarları idi. Qasımın səbri tükənmişdi, heç kimə uyuşmurdu. Nəhayət, Qarabağa qayıtmaq fikrini qətiləşdirib yır-yığış etdi, pal-paltarını qablaşdırdı. Yoldaşları onun Vətənə, erməni quldurları ilə haqq-hesab çəkmək üçün yola düşdüyünü bildikdə ona işini, iş yerini xatırlatdılar. “Vətəni qorumaqdan vacib nə iş ola bilər!?” – cavabını söyləyən Qasım ertəsi gün Vladivostokun Ussyriysk hava limanından Azərbaycana yola düşdü.

Uzaq Şərqdən Bakıya, Bakıdan isə Döylərə (Ağcabədi rayonunun ərazisində, Kür çayının kənarında qışlaq), valideynlərinin müvəqqəti məskunlaşdığı qışlağa gəldi. Çoxları, eləcə də ailə üzvləri, qohum-əqrəba elə bilirdilər ki, Qasım valideyinlərinə baş çəkməyə gəlib. Heç kimin ağlına belə gəlmirdi ki, “Qırmızı Tayotalı oğlan” Uzaq Şərqdən, Vladivostokdan gəlib Laçın dağlarında döyüşə gedir.

Hər Vətənə dönəndə ata-anası ona "evlən" desələr də, "hələ tezdir" söyləyərdi, hələ ailə qurmamışdı.

Alxaslı camaatının çox hissəsinin məskunlaşdığı Ağcabədi rayonunun Döylər qışlağında Laçın elinin igid oğulları alınmaz qala olan Laçın dağlarında döyüşməyə hazırlaşırdılar. Qasım da onlarla birlikdə idi. Onlar iyunun 29-u Döylər qışlağından Bakıya yola düşdülər. Bakıda yaradılmış Laçın hərbi qərargahında Laçın igidlərindən təşkil edilmiş könüllü döyüşçülər dəstələrə bölündülər. Qasımgilin dəstəsi 1992-ci il iyulun 1-də axşamçağı Bakı şəhərindən Kəlbəcər rayonuna doğru yol aldı.

İyulun 2-si Kəlbəcər rayonunun Qılıçlı kəndinə çatan Qasımgil hərbi qərargahda silah və sursatla təmin edilib Laçın rayonunun Şamkənd kəndinə yola düşdülər. Gecəni Qorçu kəndindəki xəstəxanada keçirən dəstə üzvləri iyulun 3-də Şamkənd kəndinə çatdılar. Hərbi and içdikdən sonra dəstə bir neçə gün hərbi təlim keçib döyüşə hazır vəziyyətə gəldi.

Beləcə, Vətənimizin cəngavər oğullarından olan Qasımın həyatında barıt qoxulu anlar, quduz düşmənlə üz-üzə dayanacağı, erməni cəlladlarına qarşı gedən döyüşlərdə rəşadətli günlər başlandı.

Qasım döyüşə Təzəkənd kəndinin qarı düşməndən təmizlənməsi ilə başladı. Bu döyüşdə ölümlə üz-üzə dayanan igid oğullarımız qana-qan deyərək düşmənlərin tutduğu mövqeyə üç istiqamətdən zərbə endirib Təzəkəndi düşmən tapdağından azad etdilər. İlk döyüş müvəffəqiyyətlə və itkisiz sona çatdı. Beləliklə, döyüş əməliyyatları uğurla davam etdirildi. Qorxmaz, cəsur, çevik, qayğıkeş, yorulmağın nə olduğunu bilməyən Qasım müharibə şəraitinə uyğunlaşdı. Bu xasiyyətlərinə görə döyüşçü yoldaşları arasında rəğbət qazandı, onlara nümunə oldu.

Qasımgilin dəstəsi daha sonra Pircahan, Qoşasu, Mişni, Alxaslı, Minkənd və bir çox digər kəndlərin düşməndən azad edilməsində iştirak edərək xüsusi fədakarlıq göstərib, düşmənə bir-birindən ağır zərbələr endirdilər. Qasımın ata yurdu Alxaslı kəndi onun öz iştirakı ilə qarı düşmən tapdağından azad olundu. Döyüş yoldaşları ilə kəndə daxil olan Qasım öz gözlərinə inana bilmədi. Kənd erməni faşistləri tərəfindən darmadağın edilmişdi. 64 ev, kənd məktəbi, xəstəxana və sovxozun idarə binası tamamilə yandırılmış, kənd xarabazara çevrilmişdir.

Qasım hələ uşaqlıqdan idmanla məşğul olurdu. Rusiyada yaşadığı vaxtlarda idmana daha çox diqqət ayırmış, karate ilə məşğul olmuşdu. Döyüş yoldaşlarına bu idman növünü öyrətməyə çalışmaqla yanaşı, döyüş meydanında da bu idman növü onun köməyinə yetirdi. Hətta kəşfiyyat və döyüş zamanı əlbəyaxa döyüşlə düşməni ya məhv edər, ya da əsir götürərdi.

Böyük hünər və mətanət sahibi olan Qasım gecələr kəşfiyyatda olar, gündüzlər isə döyüş meydanında at oynadardı.

Hoçaz yüksəkliyi uğrunda döyüşlər başlandı. Bu döyüşlərdə Qasım xüsusi fədakarlıq göstərdi. 1992-ci il iyulun 29-u günü Hoçaz kəndi düşmən tapdağından azad olundu. Qasımgilin dəstəsi kənddə yoxlama aparan zaman döyüşdən canını zorla qurtarıb "QAZ–66" markalı maşının arxasında gizlənən və maşına yaxınlaşan bir qrup Azərbaycan əsgərini məhv etmək üçün fürsət gözləyən düşmən Qasımın diqqətindən qaçmadı. Güclü hissiyatı və iti baxışları olan Qasım düşmənin üzərinə hücum çəkdi. Düşmən gözlənilməz hücumdan bir anlıq özünü itirsə də ölümünün son anında Qasıma atəş açmağa imkan tapdı. Döyüşçü dostlarını xilas edə bilsə də son anda canından əziz bildiyi Vətən torpağını öz qanı ilə suvararaq Qasım şəhid oldu. Həyatını Vətənə, torpağa, xalqa qurban verdi.

Döyüş sona çatdı, ancaq Hoçaz uğrunda gedən döyüşdə qədim oğuz yurdu olan Laçın eli yeddi qəhrəman Vətən oğlunu şəhid verdi. Hoçaz kəndindən Kamil və Asəf Məmiyev qardaşları, Minkənddən Vüqar Babaverdiyev, Vağazin kəndindən Səməd Əmirov, Bozgüney kəndindən Müzəffər Qiyasov, Alxaslı kəndindən Polad Bəylərov və Qasım Alxasov Laçın rayonunun Hoçaz kəndi uğrunda gedən döyüşlərdə qəhrəmancasına həlak oldular. Bu döyüşdə xüsusi xidmətləri olan həmin döyüşçülər qələbənin sevincini yaşaya bilmədilər. Həmin gün axşam televiziya və radio vasitəsi ilə bu bəd xəbər həlak olanların ailə üzvlərinə və yaxınlarına çatdırıldı.

1992-ci il avqustun 1-də Qasımın cənazəsi Bakının Səbail rayonunun ərazisində yerləşən Şəhidlər Xiyabanında torpağa tapşırıldı.

Uzaq Şərqdə Sakit okeana çıxan dəmir yol magistralının son nöqtəsi olan Vladivostok şəhərində yaşayıb çalışan, Sakit okeanın sularında tam qayğısız üzən, dünyanı gəzən Qasıma Qarabağ uğrunda gedən ədalətsiz müharibədə iştirak üçün heç bir dəvət göndərilməmişdi. Onu Vətənə millət qeyrəti, yurd həsrəti, milli qürur, düşmən tapdağında inləyən torpaq harayı, el-obanın dərdi qaytardı. Xocalı soyqırımının acıları, Şuşanın işğalı, Qarabağın neçə-neçə azərbaycanlı kəndlərinin od vurularaq yandırılıb viran edilməsi onu bu müharibəyə, qisasa səslədi. Bir çoxları hərbi xidmətdən yayınmaq üçün min bir bəhanə axtaranda, Vətəni dar gündə qoyub xaricə getmək üçün müxtəlif yollar arayanda, xarici ölkələrə üz tutub qaçanda Qasım Alxasov cibində xarici ölkə pasportu, xaricdə evi, iş yeri olsa da, heç bir qayğısı olmadan Sakit okeanın sularında üzsə də, od içində yanan Laçın elindən keçə bilmədi. Yurd yerinin, Vətə-

nin harayına səs verdi, müharibə acılarını daddı, düşmənin qarşısına cəsurluqla çıxdı...

Qasım döyüşlərə atılaraq məqsəd və məramına möhür vurdu, öz ölümü ilə onu təsdiq edərək şəhidliyin ən uca zirvəsinə yol açdı. Öz əməlləri ilə müqəddəs şəhid adını qazanaraq hər zaman el-obanın yaddaşında qaldı. Uzaq Şərqdə yaşasa da hər anı, hər dəqiqəsi Vətənlə bağlı olan igid oğul son anda öz canını Vətən torpağına tapşırdı.

Nakam eloğlumuz Qasımın hər kəlməsi, düşüncəsi, arzu-diləyi doğma el-obanı mənfur düşmən tapdağından azad etmək oldu və bu yolda da əbədiyyətə qovuşdu. Bağışla, qəhrəman Vətən oğlu, bağışla ki, həyatın bahasına düşmən tapdağından azad edərək al-qırmızı qanınla suvardığın torpaqlar bu gün yenə də düşmən tapdağındadır. O yerlərdə narahat gəzən ruhun qarşısında günahkarıq. Çünki dədə-baba torpaqlarımızı qoruyub saxlaya bilmədik. Bağışla...! Ancaq ümidsizliyə qapanmaq olmaz. Koroğlular, Xətailər, Babəklər dünyaya gətirən azərbaycanlı analar yəqin ki, bir daha Vətənə belə oğullar bəxş edəcək, torpaqlarımız düşməndən azad olunacaq.

Ruhun şad olsun, Vətən övladı!

**Sultan HÜMBƏTOV**

## <u>ABİTURİYENT - 2012</u>

***Bu gənclərin nümunəsində respublikamızın, eləcə də xarici ölkələrin nüfuzlu ali məktəblərinə qəbul olunan bütün abituriyentlərimizi səmimi qəlbdən təbrik edir, onların hər birinə təhsil uğurları arzulayırıq. Ümid edirik ki, yüksək mütəxəssis kimi yetişərək xalqımıza ləyaqətlə xidmət göstərəcəklər.***



**Aqşin Hilal oğlu Əzizov** 1994-cü il dekabrın 16-da anadan olub (Bu gün laçınlılar Laçında doğulmurlar). 2001-2002-ci tədris ilində Nəsimi rayon 19 №li tam orta məktəbin I sinfinə gedib. 2003-2004-cü tədris ilində Laçın rayon 15 №li tam orta məktəbin III sinfində oxuyub. 2005-2006-cı tədris ilində isə imtahan verərək Türkiyə Dəyanət Vəqfi Bakı Türk Liseyinə qəbul olub. 2011-2012-ci tədris ilində həmin liseyin XI sinfini bitirib. Qəbul imtahanlarında 622 bal toplayaraq Azərbaycan Diplomatik Akademiyasının biznesin idarə edilməsi fakültəsinə daxil olub.

Atası Hilal Xasay oğlu Əzizov 1952-ci ildə Laçın rayonunun Bozlu kəndində anadan olub. Hal-hazırda Nəsimi rayonunda müvəqqəti məskunlaşıb və Laçın rayon İcra Hakimiyyətinin Bozlu Nümayəndəliyində müavin işləyir.

Anası Yeganə Yaşar qızı Əlvəndova Laçın rayon 15 №li tam orta məktəbin direktoru vəzifəsində çalışır.

Bacıları Aysel və Həcər Azərbaycan Tibb Universitetinin, Şəbnəm isə Azərbaycan Neft Akademiyasının məzunudur.



**Xubəli Şahin oğlu Əliyev** 1995-ci ildə Cəlilabad rayonunun Şükürlü kəndində doğulub. 2001-ci ildə Şükürlü kənd orta məktəbinin I sinfinə gedib. 2005-ci ildən isə təhsilini Binəqədi rayonunun Sulutəpə qəsəbəsində yerləşən Laçın rayon 10 №li tam orta məktəbində davam etdirib. 2012-ci ildə orta təhsilini başa vurub və Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının apardığı imtahanlarda yüksək bal (589) toplayaraq öz istəyi ilə Azərbaycan Dövlət Neft Akademiyasının "Neft-qaz qurğuları mühəndisliyi" ixtisasına daxil olub.

Ali məktəbdə oxumaq arzusu gerçəkləşən Xubəli gələcəkdə seçdiyi ixtisasın sirlərinə yiyələnərək peşəkar neft mütəxəssisi kimi yetişəcəyinə inanır.



**Ülvi Novruz oğlu Alyarov** 1995-ci ildə Sumqayıt şəhərində anadan olmuşdur. 2001-ci ildə Binəqədi rayonunda 99 saylı orta məktəbin I sinfinə getmiş, 2010-cu ildən təhsilini Laçın rayon 42 saylı Qovuşuq kənd orta məktəbində davam etdirmişdir. 2012-ci ildə orta məktəbi bitirmiş, elə həmin il 555 balla Azərbaycan Respublikası Daxili İşlər Nazirliyinin Polis Akademiyasına daxil olmuşdur.

Arzusu qanunu pozanlara, cinayətkarlara qarşı cəsarətlə mübarizə aparmaq, asayişin keşiyində vicdanla durmaqdır.

**POEZİYA**

## MƏNSUR



### ƏMİOĞLULARIMA

Ataları yola saldıq, əmoğlu,
İndi növbə bizimkidi, hazırlan.
Qəlbimizi ovunduran kimsə yox,
Darıxanda danışırıq məzarla.

Qayğı, təlaş başımızı qatıbdı,
Gedən gedib, qalan itib-batıbdı.
Ömrümüzə xəzan yeli çatıbdı,
Bizsə alış-verişdəyik bazarla.

Doğmalardan çevirməynən üzünü,
Yad baxışdan itirərsən özünü.
Özgələrdən götürməynən közünü,
Yüklənərsən duva, cadu, nazarla.

Elə sanma bir kədərim, qəmim yox,
Qapısını döyəcəyim əmim yox.
O əvvəlki haylı-küylü dəmim yox,
Girlənirəm canımdakı azarla.

Can qurbandı insanların mərdinə,
Acıyıram məzlumların dərdinə.
Bel bağlama bu dünyanın tərkinə,
Düşəcəksən Mənsur kimi yazarla.

### HARADA QALDIN

Ömür ötür, yol gedirəm sükutla,
İllərimi yüklədiyim vaqonda.
Kim bilir ki, mənzilimə az qalıb,
Düşəmmərəm dayanmasa o sonda.

Uzun yollar qət etsəm də mən fağır,
Tapammadım sənə çatan bir cığır.
Harda qaldın, harda öldün, bir çağır,
İtib-batdın, de axtarım ha yanda?

Bəlkə könlün yad ünvanı seyr edir,
Həyatından günlər düşür, yaş gedir.
Hələ gəncsən, eşq canını isidir,
Ayaz vurar, neyləyərsən bəs onda?

Qəlbim qalıb balıq kimi tilovda,
Məni vaxtsız öldürəcək bu sevda.
Ruha dönüb edəcəyəm əlvida,
Son libasım kəfən adlı bir donda.

Mənsur, ovçu bərəsini düz seçdi,
Qismət yoxsa, demə ovu tez keçdi.
Usta qardaş, düzəlmərəm, ta gecdi,
İndən belə ha rəndələ, ha yon da.

### GƏLƏ BİLMƏRƏM

Əzəldən yalanla heç yoxdu aram,
And vermə, vədimə xilaf çıxaram.
Bilməm qismətimi harda axtaram,
Mən ta o ünvana gələ bilmərəm.

Ordakı sevgimin daşı sökülüb,
İlk görüş yerimiz uçub-tökülüb.
Daha qürurumun beli bükülüb,
Mən ta o ünvana gələ bilmərəm.

Haçandır görmürəm o doğma kəsi,
Üzümə, boynuma dəymir nəfəsi.
Könlümün qalmayıb eşqi, həvəsi,
Mən ta o ünvana gələ bilmərəm.

Orda ürəyimin odu sönübdü,
Sevdası göylərdən yerə enibdi.
Tanrının talemdən üzü dönübdü,
Mən ta o ünvana gələ bilmərəm.

Mənsurun işləri düyünə düşüb,
Addımı yüz səmtə, yüz yönə düşüb.
Bir səhvin ucundan nə günə düşüb,
Mən ta o ünvana gələ bilmərəm.

**AD GÜNÜMƏ**

Bu fələklə nə işim var,
Öz bəxtimlə nərd atmışam.
Zərim şeş-beş verməyəndə
Oynu yarımçıq qatmışam.

Tale payım ulduz boyda,
Di bu paydan ye də, doy da.
Gündüz yasda, axşam toyda,
Yollarda itib-batmışam.

Mərd dostlardan xərc elədim,
Beş-on şeir dərc elədim.
Namərd kəslə mərc elədim,
Olub qalanı satmışam.

Saçlarıma dən saldırdım,
Gözümə eynək aldırdım.
Bir də başımı qaldırdım,
Atam yaşına çatmışam.

Mənsur, həyat xoş duyğuymuş,
Gah isti, gah soyuğuymuş.
Ömür şirin bir uyğuymuş,
Fil qulağında yatmışam.

**DÜŞÜBDÜ**

Dostlar məni qınamasın,
Təbim sözümdən düşübdü.
İndi hamı söz uydurur,
Şeir nəzmdən düşübdü.

Hər yetənə yazan dedim,
Başa çəkdim, ozan dedim.
Bacarırsan qazan dedim,
Günah özümdən düşübdü.

Nadanlara əl çaldıqca,
Çala-çala alçaldıqca.
Duymamışam ac qaldıqca,
Mədəm həzmdən düşübdü.

Tanrıma bağlı insanam,
Haqqı-sayı necə danam?
Dərdimi dağ edən anam
Mənim üzümdən düşübdü.

Mənsur, qələm varaqsızdı,
Mərd meydanda yaraqsızdı.
Həyat elə maraqsızdı,
Dünya gözümdən düşübdü.

**QARDAŞ**

Vaxt var idi yumruq kimi
Bir idik, qardaş, bir idik.
Sevinc əkib, dərd becərdik,
Nər idik, qardaş, nər idik.

Ülfət qıldıq şeytan ilə,
Həqiqəti bilə-bilə.
Xəcalətdən gilə-gilə
Əridik, qardaş, əridik.

Kor olmadıq tüstümüzə,
Dostkən girdik qəsdimizə.
Düşmən kimi üstümüzə
Yeridik, qardaş, yeridik.

Kim nə çaldı baş oynadıq,
Bilmədik, çaş-baş oynadıq.
Gözümüzdə yaş oynadıq,
Kiridik, qardaş, kiridik.

Mənsur, olanı unutma,
Yaran bağlanıb, qanatma.
Sən deməynən ucdantutma
Şər idik, qardaş, şər idik.

**PUBLİSİSTİKA**

## HƏYAT QƏDƏR ŞİRİN ANAM

*Anadır həyatın, varlığın canı,*
*Anadan əziz şey dünyada hanı?!*

Ana! Bəşəriyyətin müqəddəs simvolu, insanlığın ilk və son kəlməsi, həyat qədər şirin Ana!

Tarixin qeyrətli, tərbiyəli, dəyanətli ana-qadınları az olmamışdır. Məhəmməd Peyğəmbərin VII əsrdə anaya-qadına verdiyi böyük qiymət tarixə qızıl hərflərlə yazılıb: "Cənnət anaların ayaqları altındadır". Ulu Dədə Qorqud dövründə böyük şahların, sərkərdələrin ananı özlərinə müqəddəs səcdəgah bilmələri, ana-qadın ləyaqətini uca tutmaları məlumdur. İgidlikdə kişilərdən heç də geri qalmayan, şərəf-ləyaqətini, qadın adını namusla, vicdanla qoruyan ana-qadınlar bu gün də əskik deyil.

Anam Suqra müəllimə belə qadınlardandır. Yaşadığı həyatı xalqa, dövlətə xidmət etməklə keçirib. Gənc yaşından əlində qələm yeni-yeni nəsillərin təlim-tərbiyəsində, ixtisaslı kadr kimi yetişmələrində gərgin əməyi olub.



1933-cü ilin baharında Laçın rayonunun Qarıqışlaq kəndində doğulub. Atası Səməd dövrünün sayılıb-seçilən kişilərindən olub, kənddə mühüm vəzifələrdə işləyib. Anası Sona xanım bəy nəslindən olan Mirzə yüzbaşının qızıdır. Mirzə yüzbaşı böyük bir əraziyə başçılıq etmiş, dövrünün ictimai-siyasi işlərində fəal iştirak etmişdir. Məşhur el qəhrəmanı Sultan bəylə yaxın dost və silahdaş olmuşdur. Sultan bəy həmişə o zonaya qonaq gələndə Mirzə babamgildə qonaq qalar və sərhədlərimzin riyakar erməni fitnəkarlarından qorunması üçün tədbirlər planı hazırlayarmışlar. Bu fakt tarixi kitablarda da əksini tapmışdır. Mirzə yüzbaşının iki oğlu və iki qızı olmuşdur. Oğulları Kərim bəy və Rza bəy xaricdə yüksək təhsil alaraq dövrün nüfuzlu ziyalılarından olublar. Kərim bəy rus, ərəb-fars, ingilis, fransız dillərini çox gözəl bilirmiş. Ev təhsili görmüş Sona nənəm çox gözəl, xeyir əməllər yiyəsi və ürəyi kövrək xanım olmuş, kasıblara, yetimlərə və kimsəsizlərə həmişə əl tutmuşdur. Anamgil ailədə iki bacı olublar. Anam 7 yaşında, 1-ci sinifə getmək macalında Sona nənəm 22 yaşında qəflətən vəfat edir. Ürəyi elə körpəlikdən dağla-

nır anamın. Həmin ilin yayı – 1941-ci il iyunun 22-də dəhşətli Böyük Vətən Müharibəsi başlanır. Səməd babam səfərbərliyə alınaraq ön cəbhəyə göndərilir. Analarını itirən körpə qızlar əmi arvadının himayəsində qalırlar. Anam həmişə deyirdi ki, Fatma bibim bizə yaxşı olub, korluq çəkdirməyib.

Babam artileriya alayında top komandiri olub. Müharibənin odlu-alovlu illərində ailəsi ilə əlaqə saxlayar, körpə balalarından xəbər tutarmış. Arada babamdan xəbər çıxmır. Onun öldüyünü düşünürlər. 6-7 aydan sonra xəbər çıxır ki, ağır yaralı halda, huşsuz vəziyyətdə hospitalda yatırmış, üz-çənə sümükləri parça-parça olubmuş. Sağalıb yenə də ön cəbhəyə gedir. Cəsur və qorxmaz Vətən əsgəri olan babam Berlinə qədər gedib çıxmışdır. Çoxlu orden və medalları var idi. Müharibə qurtardıqdan sonra babam qayıdır və yenidən ailə qurur, daha bir qızı olur. Oğlu olmayan babam anamı – Suqra müəlliməni özünə oğul sayır və onu lap çox istəyirdi. Hər üç qızını oxudub, təhsil verib babam. Anam müəllimə, Mina xalam aqronom, Kubra xalam isə həkimdir.

Elmə, kitablara böyük həvəsi olduğuna görə anam orta məktəbi Laçın şəhərində bitirir və Ağdamda 2 illik Pedaqoji Müəllimlər İnstitutunda təhsilini davam etdirir. Anam çox savadlı və istedadlı tələbə olmuşdur.

1952-ci ildə atam İbiş müəllimlə ailə qurublar. Atam yüksək dünyagörüşə malik olduğuna görə anamın ali təhsil almasına kömək edir. V.İ.Lenin adına APİ-nin (indiki ADPU) Azərbaycan dili və ədəbiyyatı fakültəsinə daxil olan anam həm Qarıqışlaq kənd orta məktəbində ixtisası üzrə dərs keçir, həm də qiyabi yolla təhsilini davam etdirir. Zahiri kimi batini də çox gözəl olan anam xeyirxah əməllər yiyəsi, mərd xanım kimi tanınıb. Gənc yaşlarından el ağbirçəyi adına yiyələnib. Atamın ünvanına həmişə deyirdilər ki, İbiş müəllimin poladdan möhkəm ailəsi – qadını var.

Məktəbdə fəaliyyətə başalyan anam dərhal öz dərin savadı, mehribanlığı və şagirdlərə ana qayğısı göstərməsi ilə həm şagirdlərin, həm müəllimlərin, həm də valideynlərin diqqətini cəlb edir. Məktəb şagirdləri onlara Suqra müəllimin dərs deməsini istəyirdilər. O vaxt məktəb böyük idi. Bütün siniflər qoşa, hətta üç sinif idilər. Onbirillik məktəbdə yaxın kəndlərdən – Bozlu, Hacılar, Soyuqbulaq, Zeyvə, Kosalar, Malıbəy, Quşçu, Mirik, Sadınlardan uşaqlar bizim məktəbə oxumağa gəlirdilər. Müəllimlər öz uşaqlarını anamın dərs dediyi siniflərə qoyurdular. Elə buna görə idi ki, hər il Qarıqışlaq kəndi üzrə ali məktəbə daxil olanların sayı artırdı. Kənd üzrə gənc ziyalılar çoxluq təşkil edirdi. Məktəb yetirmələri anamın adını həmişə əziz tutardılar, harada olmalarından asılı olmayaraq hər il anamla sinif halında görüşə gələrdilər, əllərindən öpər-

dilər. Anam heç vaxt uşaq qəlbinə dəyməzdi, pedaqoji ustalıqla başa salıb elmi səylə oxumalarını məsləhət görərdi. Hüsn-xətlərinin gözəl olması üçün çox çalışırdı.

10 il məktəb direktoru işlədi anam. Dəfələrlə kənd və rayon sovetinə deputat seçilərək xalqın dərd-sərinin düzəlməsi, kəndimizin abadlaşması üçün əlindən gələn köməyi əsirgəmədi.

9 övlad böyüdüb boya-başa çatdırdığına görə "Qəhrəman Ana" adına layiq görüldü. Anam hər birimizin problemləri ilə ayrıca məşğul olur, elmə, təhsilə bizdə həvəs oyadırdı. Şagirdləri ilə bizə fərq qoymazdı. Böyük ailəyə qulluq edirdi anam. Yaşlı qaynanası, 9 övlad, məktəb işi, vəzifə, qonaq-qaralı, böyük məhləli ev, tikinti işləri, əsgər, tələbə, şagird... Həyətdə mal-qara və ev quşları da saxlayırdı. Valideynlərimin hər ikisi zəhmətkeş, öz əllərinin halal zəhməti ilə dolanan əli qabarlı insanlar olublar.

Böyük bağımız-bağçamız var idi. Atam çox səliqə ilə hər cür meyvə ağacları əkmişdi. Rəngbərəng qızılgül kollarının ətri bütün kəndə yayılırdı. Ağacların dibində nərgiz, bənövşə və başqa gül-çiçəklər əkmişdilər. Yaz, yay, payız vaxtı evə gələn qonaqlar qədim nağıllardakı kimi olan bu gözəl bağda yeyib-içib dincəlirdilər. Meyvə vaxtı atam dostlarını yaddan çıxarmaz, paylarını göndərərdi.

Anamı hamı özünə ağbirçək sayırdı. Kəndimizin qadınları, qız-gəlinləri onunla məsləhətləşirdilər.

Ailəmizə böyük faciə üz verdi. Atam 1992-ci ilin mayında qeyri-bərabər döyüşdə qəhrəmanlıqla vuruşaraq şəhid oldu. Bu hadisə ailəmizi, bizi sevənləri bərk sarsıtdı. Yazıq, könlü qubarlı anam! Niyə həyat səninlə belə acı rəftar etdi?! Körpəlikdə ananı, yaşlı vaxtında isə başının tacını əlindən aldı. Onsuz da uşaqlıqdan nəmli olan gözlərin axar bulağa döndü. Sinənə çalın-çarpaz dağ çəkildi. Yenidən dodaqların ömürlük gülüşə həsrət qaldı. Dağlı köksünə qurban olum, Ana! Atamı tapan gündən bütün ümidlərini ona bağlayan, arxasında əzəmətli dağın dayandığını hiss edən və onu belə amansız faciə ilə itirməyi ağlına gətirməyən anam bərk sarsıldı. İki dəfə infarkt keçirdi. Azman atamın həyatda olmaması onu dərdə-fikrə saldı və şəkər xəstəliyinə düçar oldu. Bərk sarsılan qeyrətli anam özünü itirmədi. Əsirlikdə olan oğlunu mərdliklə düşmənin pəncəsindən aldı. Bizi başına toplayaraq ailəmizi dağılmağa, sınmağa qoymadı bu dəyanətli ana. Daha iki tələbə oxutdu. Atamın işinin yarımçıq qalmasına yol vermədi. Amma ümidini heç vaxt üzmürdü atamdan. Bir dəfə ömrünün son illərində məndən atamın neçə yaşında dünyadan köçdüyünü soruşdu və dedi ki, atanın həmin yaşına çatanda mən də bu dünyadan

köçəcəyəm. Dediyi kimi də oldu. 2000-ci il noyabrın 17-də anam həmin yaşda qəlbi atam nisgilli, son sözü “Atan” kəlməsi ilə dünyasını dəyişdi. Gizli-aşkar axıtdığın göz yaşlarına, nisgillər çəkmiş qubarlı ürəyinə qurban olum, Ana! Gənc ikən bu dünyada bizi tək qoydunuz!

Anamı ən çox sarsıdan işlərdən biri də məcburi köçkün olub, ata-baba yurdundan, elindən, bağ-bağatlı evindən didərgin düşməsi və özünə, ad-sanına yaraşmayan şəraitdə yaşaması idi. 1992-ci ildə Bərdə rayonunda, “Pambıqçı” sanatoriyasında məskunlaşdıq. Bərdədə fəaliyyət göstərən Laçın rayonunun ilk orta məktəbində anamla mən köçkün balalarının təlim-tərbiyəsi ilə məşğul olduq. Evimiz, məhləmiz, el-oba bir an onun dilindən düşmürdü. Həmişə deyirdi ki, ölüm Allah əmridir, kaş atan belə faciə ilə dünyadan köçməyəydi. Allah hər ikinizin ruhunu şad eləsin, o biri dünyanızı versin. Təskinliyimizi tez-tez onların məzarı üstünə gedib hər ikisinə Quran oxutmaqla tapırıq. Qərib yerdə qərib məzarına qurban olum, Ana. Yas mərasiminə gələnlər bu nurani qadının ölümünə yanır və deyirdilər ki, o təkcə sizin yox, bizim də anamız olub. Tək sizdən getmədi, bizdən də getdi. Fatma ana timsallı, kimsəni özündən incitməyən, məğrur və ləyaqətli anam.

Sevincin qəm oldu körpə yaşından,
Kədərli qəlbinə qurbanam, ana.
Payına dərd düşdü ana sarıdan,
Anasız gününə qurbanam, ana.

Həyat nə amansız oyun oynadı,
Körpə qızcığazı əzaba saldı.
Gözləri hər yerdə ana aradı,
Nəmli gözlərinə qurbanam, ana.

Dilin şükrə gəldi biz doğulanda,
Nəhəng arxan idi atam yanında.
Oğlanlar sağında, qızlar solunda,
Xoşbəxt günlərinə qurbanam, ana.

Sən demə fələyin çoxmuş gərdişi,
Qəlbi xəncərləmək olub vərdişi.
Atamı əlindən almaqmış işi,
Yanan ürəyinə qurbanam, ana.

***

Ey Tanrı, dözüm ver bu dərdi çəkək,
Çətin günümüzdə ol bizə kömək.
Onların ocağı sönməsin gərək,
Göstərmə sən bizə qalanlardan qəm.



**Rəfiqə ƏSGƏROVA,**
***Laçın rayon Ağanus kənd orta məktəbinin müəllimi***

DÜNYA ƏDƏBİYYATI

Robin ZİGER

## ZƏFƏR ÜÇÜN DOĞULANLAR
### (Seçməli ixtisarlarla)
*-Davamı-*

**Necəliyimiz.** Özünüzü necə görürsünüzsə, elə də olacaqsınız. Kaliforniyalı bir cərrah olaraq Maksvel Malts özünün klassik "Psixokibernetika" kitabında görünüşləri ilə bağlı özlərini əməliyyat etdirən adamlardan bəhs edir. Bədənindəki ləkəni aldırmaq istəyən bir qadının hekayəsini anladır. Qadın bu ləkəni çirkin sayıb ondan qurtulmağı düşünür. Cərrah qadının məntiqin səsinə qulaq asmayacağını görərək əməliyyatı gerçəkləşdirməyə razı olur. Bu arada o, təsadüfən qadının kişi dostu olan gödək, yöndəmsiz adamın üzündə kifir bir xal olduğunu fərq edir. O, onu götürə biləcəyindən danışanda, həmin şəxs təəccüblə "mənim görünüşümdə heç bir problem yoxdur", - deyir.

Bu adamın cəlbedici olduğuna dair güclü mənlik obrazı onun davranışını, işini yürütmə tərzini və ən əsası özü barədə düşünmə şəklini formalaşdırırdı. Bunu o özü edirdi. Rəfiqəsi isə onun tam tərsiydi. Gözəlliyinə rəğmən görünüşü ilə bağlı gerçək bir güvəni yox idi və ləkə onun zehnində elə böyümüşdü ki, əslində cazibədar olmadığına dair daxili inamını gücləndirmişdi.

Yürüməyi öyrənən bir uşağı gözönü edin. Bunu bacaranadək o, ən azı 240 dəfə yıxılacaqdır. Təbiət sanki ona "vaz keçmə, çünki vaz keçdiyin zaman yalnızca başarısız olarsan" deməkdədir.

Öyrənmə, əldə etmə və bacarma qabiliyyətləri fitridirlər və fövqəladə dərəcədə güclüdürlər. Uşaq nə qədər yıxılırsa-yıxılsın, yürüyə biləcəyi ilə bağlı varlıq obrazı sarsılmaz olaraq qalır, şüursuz bir şəkildə xətalarından dərs alacağını bilir.

Yetkinlik dövründə daxili potensialla bağlı Tanrı vergisi olan bu qənaət çox insanda tənəzzülə uğrayır. Fəqət başarılı insanlar hədəflərinə çata biləcəklərinə şübhəyə yer qoymayan bir şəkildə inanırlar. Uğursuzluğun, bacarmamanın varlığımızın bir ifadəsi olmadığını, prosesin bir hissəsi olduğunu qəbul etmə qabiliyyəti başarının vazkeçilməz bir ünsürüdür.

Amerikadakı bir araşdırma dörd yaşındakıların yüzdə 96-sının yüksək bir özünəsayğıya və özləri ilə bağlı güclü bir varlıq obrazına sahib olduğunu göstərmişdir. Bu uşaqlar dünyanın ayaqları altında olduğuna inanırdı: astronavt, balerin, doktor, kovboy, pilot, hər nə istərlərsə, ola bilirlərdi. Araşdırmanın çox təəccüblü tərəfi, on səkkiz yaşına çatdıqları

zaman onlardan yüzdə beşinin normal bir varlıq obrazlarının olmaması idi. Bu illər boyunca onlara "Sən mahnı oxuya bilməzsən, sən bacarıqsızsan. Ay, axmaq! Özünü nə sayırsan? Sən uğur qazanmazsan" deyilmişdir. İstər bizə öyrənmə qabiliyyətimizin olmadığını söyləyən bir müəllim, istər bacarıqsız olduğumuzu söyləyən bir ana və ya ata, istərsə də yaxşı niyyətlə də olsa aşbazlığınızın ümidsiz olduğunu təkrarlayan bir dost olsun, böyüdükcə varlığımızın necəlik obrazı get-gedə daha artıq dərəcədə xarici amillər tərəfindən şəkilləndirilir. Bu cür yozumlar, yanaşmalar şüuraltında toplanıb qalmaqdadır. Şüuraltımız bunlardan varlıq, mənlik obrazımızı zəiflətmək və yerinə daha şübhəli bir obraz qoymaq üçün istifadə edir.

Məsələ bundadır ki, əgər anormal bir varlıq (mənlik) obrazınız varsa, daim bunu əks etdirəcək və ya doğrulayacaq dəlillər axtaracaqsınız.

**Qədər.** İnsanların böyük bir təbii bacarıqla xüsusi bir şeyə nail olduqları zaman başarılarını taleyə və buna hazır olmalarına bağlamaları bəzən haqlı görülə bilir; fəqət bir az dərinə varın, böyük xəyallar qurmuş və şüursuz bir şəkildə öz uğurunun toxumlarını doğru yerlərə əkmiş birisini görəcəksiniz. Onlar buna "qədər" deyə bilir, amma mən Bernard Şounun haqlı olduğunu düşünürəm. O, "insanlar öz vəziyyətlərinə görə daim şərtləri suçlayarlar" deyə yazmışdı. "Mən şərtlərə inanmam. Bu dünyada işləri yaxşı gedənlər, yerlərindən qalxıb şərtləri tapan insanlardır. Onları tapa bilmirsinizsə, yaradın". Bu insanlar istədiklərini gerçəkləşdirməyə qərarlıdırlar. Gələcəyin qaçılmaz bir şəkildə var olduğuna inanmıram. Gələcəkdəki təcrübələrimizi müəyyənləşdirən indiki və buradakı əməllərimizdir.

Qədərlərimiz böyük ölçüdə qoyduğumuz hədəflərlə təyin olunur. Böyük xəyallar qurub bunların olacağını ümid edirsiniz? Yoxsa umsunmaqdan, xəyal qırıqlığından qaçınmaq üçün xəyal qurmağa sonmu verdiniz?

Bir şey tərs getdiyi zaman insanların çoxu ruh düşkünlüklərini "Bunun belə olacağını bilirdim" kimi yozumlarla ifadə edər. Və eyni inancla, ümumiyyətlə, şanssız, bacarıqsız və ya uğursuz olduqlarından dəm vurarlar. "Nədən mənimlə hey belə olur?" tezislərinin məğzini yaşamlarındakı olayların onlara daim şanssız olduqlarını nümayiş etdirmələri və belə də qalacaqlarını düşünmələri təşkil edir. Fəqət gerçək budur ki, özləri öz bəxtsizlikləri ilə bağlı güclü bir inanc yaratmışlar və başlarına gələn hər şey də bu inamı gücləndirməyə xidmət etməkdədir. Bu təcrübəni şüuraltılarında saxlayar və beləcə zəif varlıq obrazlarını doğrulamış olarlar.

**Tərsliklər (kəcliklər).** Fərdlər və iş yerləri qaçınılmaz şəkildə bu və ya başqa sayaq əksliklərlə üzləşirlər. Bu əksliklərə öhdəsindən gəlinəcək tərsliklər və məharətimizə bir meydan oxuma kimi baxmasaq, onlar özümüzə olan inamımızı yox etmə vasitələrinə çevriləcəklər.

Naqolay bir durum içində olan fərd və ya şirkət kiçik əksliklləri belə məşğul olunacaq böyük problemlər olaraq görür.

**Fürsətlər insanların çoxu tərəfindən qaçırılır, çünki iş qiyafəsi geyinər və işə bənzərlər.**

*Tomas Edison (1847-1931) – Amerikalı ixtiraçı*

Başarılı insanlar əksliklləri baxış bucaqlarına daxil edərlər. Nəzarət edə bilməyəcəkləri şeylərin – faiz dərəcələri, hava iş yoldaşlarının etibarlılığı, məmurlar – tez-tez yolunda getməyəcəyindən çıxış edirlər. Etdikləri şey – bunu qəbul etmək, uzlaşmaq və əllərindəki işi davam etdirməkdir.

Bir çoxumuz əksliklləri etməli olduğumuz şeyi bacarmamağımızın üzrü kimi irəli sürürük: “Ortağım pulu götürüb aradan çıxdı”, “Bank faizləri qaldırıldı”, “Ən böyük tədarükçü firma iflas etdi”. Bu cür tərsliklər həyatımızda heç əskik olmaz. Sahib olmadığımızsa, boksa bənzətmiş olsaq, küncümüzə çəkilmə, zehnimizi təmizləmə, yenidən fokuslanma və bacarmaq üçün yola qoyulduğumuz işə davam etmək qabiliyyətidir.

**Özünü həsretmə.** Tərsliklərin arasından hədəfinizə doğru irəliləmək yalnızca güclü bir özünəinam və konkret bəllilənmiş bir hədəfdən daha artıq şeyi gərəkdirir. Bu, özünü həsretmə istər. Özünü həsretmə qərarlılığa bənzəyir, ancaq qərarlılıq o ana aid bir duyğu ola bilirkən, özünü həsretmə şərtlərdəki bütün dəyişikliklərə rəğmən davam edən polad kimi bir iradədir. Uğurun, başarının müəzzəm bir amili olaraq o, haqqında çox qonuşulan mücərrəd bir ünsür və bir iş ortamında asanlıqla saxta bir biçimdə nümayiş etdirilmə təhlükəsi olan bir keyfiyyətdir.

Bir düşünün. İş yerində yeni bir təşəbbüsdə bulunulur və ya bir təkmilləşdirmə proqramının tətbiqinə başlanılır. Müdiriyyət personallardan proqram tam tətbiqə girənədək özlərini bu işə həsr etmələrini istəyir, rica və ya bəlkə də tələb edir. Şübhəsiz, zahirən hər kəs məsələnin ciddiliyini qəbul edər, özünü buna həsr edəcəyini söylər. Amma bu belədirmi?

Şövq özünühəsretmə deyildir. Gerçək özünühəsr sandığımız şey arzudan başqa bir şey deyildir. Bir dəfə birisi mənə minnətin ən qısa ömürlü duyğu olduğunu söyləmişdi. Fəqət mən bunun düz elə arxasınca şövqün gəldiyinə inanıram. Komanda çalışmalarında çox böyük həyəcan və enerji yarada bilən şövq son təhlildə özünü həsr etmənin yerini ala biləcək bir şey deyildir. Bir qəzaya uğradığınızı, xəstəxanaya gətirildikdə biri

şövqlü, digərisə özünü məsləkinə həsr etmiş iki doktorun hazır gözlədiyini xəyal edin. Hansının sizə baxmasını istərdiniz?

Özünüzü bir amala həsr etdiyiniz zaman bunu gerçəkləşdirəcəyinizə dair yüzdə yüz inamla hərəkət etməlisiniz. Bunun orta dərəcəsi yoxdur. Bir azca hamilə olmaq mümkün olmadığı kimi, özünüzü bir azca həsr edə bilməzsiniz.

Mütləq bir şəkildə inandığınız bir şeyə və ya birinə – ailənizə, sevdiyinizə özünüzü həsr etmənizin dərinliyini incələyin və sıxıntılı durumlarda onlara nə qədər yardım etməyə hazır olduğunuzu zehninizdə canlandırın. Bu güclü bir duyğudur. Özünüzü uğura, başarıya gerçəkdən həsr etməni təmin etmə prosesində yaratmanız gərəkən duyğu səviyyəsi məhz elə budur.



Həyatınız sizə bağlıdır. Həyat kətanı verir, rəsmi siz özünüz çəkirsiniz.

**Səlcuq türkcəsindən uyğunlaşdıranı:**
**Yusif OTAYLI**

**KİTAB RƏFİ**




**“YEDDİ QIFIL ALTINDA”**

“Yeddi qıfıl altında” adlanan bu kitab şair, publisist Kamil Vəfadarın (əsl adı Habildir) “Oxunmayan məktublar” və “Oğuldərənin igid oğlu” kitablarından sonra oxucularla üçüncü görüşüdür. 116 səhifədən ibarət olan kitabın redaktoru Azərbaycan Yazıçılar Birliyinin üzvü Telman Hüseyn, rəyçisi isə Azərbaycan Yazıçılar Birliyinin üzvü Rizvan Nəsiboğludur.

İnanırıq ki, çox istedadlı şair qələmindən çıxan bu kitab da əvvəlki kitabları kimi maraqla oxunacaq, oxucular tərəfindən rəğbətlə qarşılanacaq.

**POEZİYA**



**Şərahil LAÇIN**

## ŞAHMAR ƏKBƏRZADƏYƏ

Namərdlər çəkdilər dağ Qarabağa,
Bir dur, qisasın var, alası, Şahmar.
Hər gün yağmur olub yağ Qarabağa,
Məkanın ərşlərin-əlası, Şahmar.

Pənah nə hallarda, Qoşasu ağlar,
Sultanı, Xosrovu, Paşası ağlar.
Üzeyir pərişan, Şuşası ağlar,
Getdi Qarabağın qalası, Şahmar.

Ocağın başında neçə yağı, yad,
Vətən can üstədi, bir dur, bir əl at.
Xudusuz yetimdi bir el, bir elat,
Yoxdu Mərzilinin balası, Şahmar.

Ərlərin ərindi yaman günündə,
Qaldı dünənində şöhrət də, ün də.
Yolunu gözləyir Çəmənlinin də
Çəhlimi, cığırı, talası, Şahmar.

Ruhun baş çəkirmi Cıdır düzünə,
Həyan ol Qırxqıza, dağlar qızına.
Dözüb Dəlidağın dəli nazına,
De bitər ayrılıq çiləsi, Şahmar.

Soldu Qarabağın, o gülüstanın,
Qərvəndin, Gülablın, Xındırıstanın.
Qanqallar bitirdi bağın, bostanın,
Yoxdu "alağını" yolası Şahmar.

Turşsunun başında şimşəklər çaxır,
Çiləli Çilgəzin yollara baxır.
İsa bulağında susub çal-çağır,
Dərdli şikəstənin naləsi Şahmar.

Gözəllərin bənizləri qan ağlar,
Xanimansız Xan qızları qan ağlar.
Kəhrizlinin kəhrizləri qan ağlar,
Yurd-yuva üsyanda, el asi, Şahmar.

Hələ qeyrətimiz, üz arımız var,
Orda qazılacaq məzarımız var.
Bir gün o yerlərə güzarımız var,
O gün olasıdı, olası, Şahmar!

## NİYƏ GƏLMİR

Səndən gileyliyəm, ana təbiət,
Zavallı bağçama bar niyə gəlmir?
Deyirlər ağlayan gülər nəhayət,
Mənim də xoş günüm var, niyə gəlmir?

Könlüm keçmişləri anar, yad eylər,
Bir vüsal eşqilə min büsat eylər,
Kimi nişan qoyar, kimi ad eylər.
Bəsölləm, üstümə yar niyə gəlmir?

Bəxtim yazılmadı mərhəmət ilə,
Gah qəmlə uyudum, gah həsrət ilə.
Şərahil, bu yazı, bu qismət ilə
Gen dünya başına dar niyə gəlmir?

**YUBİLEY**



## Nadir AZAYOĞLU-50

Dünyaya göz açdığı Laçın dağlarının həsrətini, el-oba nisgilini 20 ildir ki, qəlbində gəzdirən, ağrısını-acısını söz-söz misralara toxuyan istedadlı şair Nadir Azayoğlunun 50 yaşı tamam olur.

Dağ çayları kimi çağlayan şair ömrünün o qədər enişi-yoxuşu var ki... Amma onu daha çox bakirə xatirələr özünə çəkir, göz yaddaşında uyuyan təbii gözəlliklərin ağuşuna can atır:

***Boylanam həsrətlə gah sola, sağa,***
***Vüsal şəlaləsi qona dodağa.***
***Buludlar toqquşa, şimşəklər çaxa,***
***Qata qabağına yağışlar məni.***

Təəssüf ki, arzuladığı yağışlar şairi o doğma ünvana aparmaq gücündə deyil hələ. Ömrünün bəxtəvərli günləri küsüb şairdən:

***Hər arzuma günü çıxır,***
***Bir dərdimdən mini çıxır.***
***Nə dərdimin ünü çıxır,***
***Nə yoxdu hakim ömrümə.***

***...Belə ömrə ölüm gəlmir,***
***Çağırmağa dilim gəlmir.***
***İstəsəm də əlim gəlmir***
***Bu bəxti əkim ömrümə.***

Qismətə bax, İlahi! “Dərdlərindən yarıyan” şairin yubileyində də qəm-qüssə yaxamızdan əl çəkmir, “Laçına yağan qar”ın soyuğu çıxmır canımızdan.

Bizi bu dərdin əlindən də şair özü alır, kədərimizi nikbinliyə çevirməyi bacarır:

***Məni belə fağır bilmə,***
***Hələbdən, Xoydan gəlirəm.***
***Ruhum yurda yas saxlayır,***
***Təbrizdən toydan gəlirəm.***

Nadir Azayoğlu kimliyini tanıda-tanıda “Əkdiyi tutun barını çırpıb, qarını çırpmayan” namərdlərə ismarış göndərməyi də unutmur:

***Çaylar keçdim bir dəryacan,***
***O tayı ruh, bu tayı can.***
***Mən Doğudan Batıyacan***
***Ulu bir soydan gəlirəm.***

Şəcərəsi ulu bir soydan gələn nəsillərin tezliklə dədə-baba torpaqlarına qayıdacağına inanırıq. Elə bu inamla da qələm dostumuzu 50 illik yubileyi münasibətilə səmimi qəlbdən təbrik edir, ona uzun ömür, can-sağlığı, yaradıcılıq uğurları və Laçınlı günlər arzulayırıq!

**“Laçın yurdu”**

**LAÇIN TƏBİƏTİ**

## QARAGÖL DÖVLƏT QORUĞU

Azərbaycan Respublikası Nazirlər Sovetinin 17 noyabr 1987-ci il tarixli qərarı ilə Qaragöl (Sevinc) respublikalararası dövlət qoruğu yaradılmışdır. Qaragöl dövlət qoruğu Laçın rayonu ilə Gorus rayonu sərhədində dəniz səviyyəsindən 2658 metr hündürlükdə yerləşir. Qoruğun ümumi sahəsi 240 ha-dır, bura 176 ha İşıqlı, Qaragölün su akvatoriyası və gölün sahili boyunca 100 metr enində 64 ha sahə aiddir.

İşıqlı Qaragölü (Sevinc) dəniz səviyyəsindən 2658 m hündürlükdə Qarabağ vulkanik dağ silsiləsinin cənub hissəsində, Həkəri çayının sağ qolu olan Ağoğlan çayının mənbə hissəsi böyük İşıqlı dağının (3548 m) şimal ətəyində, şimal-qərbdən Dəmirdaş və kicik İşıqlı (3452 m) dağı ilə, şimaldan Canqurtaran (2790 m) dağı, şərqdən isə alçaq moren tirəsi ilə əhatə olunmuşdur. Bu göl sönmüş vulkan kraterini xatırladan relikt su mənbəyidir. Stratiqrafik cəhətdən Qaragöl rayonu yuxarı pliosen yaşlı suxurlar içərisindədir.

Gölün uzunluğu 1950 metr, maksimum eni 1250 m, sahil xəttinin uzunluğu 5500 m, dərinliyi maksimum 7,8 m, hövzəsinin sahəsi 13 $km^2$-dir. Hesablamalara görə, göldə suyun həcmi 10 mln $m^3$-dur. Gölün suyunun şəffaflığı 4,6 metrdir. Gölün dibi sahilə yaxınlıqda müxtəlif ölçülü daşlardan ibarətdir. Mərkəzə doğru isə daşların (süxurların) ölçüsü azalır və nəhayət mərkəzi hissəsi xırda dənəli çöküntülərdən ibarətdir.

Oktyabr ayının ikinci yarısından aprelin axırlarına kimi donmuş olur. Sahildən mərkəzə doğru 20-25 metrə qədər məsafədə buzun qalınlığı 50 sm-dən çox olur. Burada qarın qalınlığı isə 40-45 sm-ə kimi olur.

Qoruqda 102 bitki növü və yarımnövü vardır ki, bunlar 68 növ və 27 ailədən ibarətdir.

Gölə heç bir yerdən su axımının olmamasına və suyun çox təmiz və şəfalı olmasına görə xalq bu gölə müqəddəs ibadət yeri kimi baxırdı.

1964-cü ildən gölün Ermənistan sahillərində heyvandarlıq fermalarının tikilməsi, göldə güclü nasos stansiyaları tikərək onun suyundan Gorus rayonunun əkin sahələrinin suvarılmasında istifadə edilməsi həm gölün çirklənməsinə, həm də onun səviyyəsinin aşağa düşməsinə səbəb olurdu. O vaxtlar laçınlıların ermənilər tərəfindən belə münasibətə narazılıqları qismən də olsa onların fəaliyyətlərini məhdudlaşdırırdı. Hazırda nəzərdən kənar qalmış gölün suyundan intensiv istifadə göl üçün qarşısıalınmaz neqativ təsirlərə gətirib çıxara bilər.

**POEZİYA**

## Namiq ZAMAN



### YAŞADI

Özünü aldatmamış,
İpə-sapa yatmamış,
Günahlara batmamış
Hansı bəndə yaşadı?!

Üzdə sevinc, gözdə nəm,
Həyat üçün oldu cəm.
Ürəklərdə kədər, qəm,
Saçda dən də yaşadı.

“Haqq” deyənin yox günü,
Oldum onun sürgünü.
İlahinin xoş günü
Məndən gendə yaşadı.

Ha sığalla, ha yon da,
Zülüm olmaz bu donda –
Yaşamadım mən onda,
Ömür məndə yaşadı!..

### MƏN

Dolanım başına, olum qurbanı,
O gözəl diyarın balasıyam mən.
Dərəsinin bənövşəsi, nərgizi,
Dağının-düzünün lalasıyam mən.

İgid ərənlərlə nəfəs-nəfəsə,
Əl uzadıb ələ, səs verib səsə,
Əcəl aman versə, ölüm gözləsə,
Yolum o yerlərdən salasıyam mən.

Qələm yaza bilmir ürək deyəni,
Sevmirəm namərdə boyun əyəni.
Tarda “Heyratı”nı, “Mənsuriyyə”ni,
Sazda “Kərəmi”ni çalasıyam mən!

Namərdlə yol tutan mənzilə çatmaz,
Namiq, mərdi səslə, mərd səni atmaz.
Qürbətdə torpaq da üstümə yatmaz,
Gedib o yerlərdə qalasıyam mən,
Ölüb o yerlərdə qalasıyam mən!..

### DÜNYANIN

Narazıdı – oturan da, düşən də
Qan qoxuyan yəhərindən dünyanın.
Vaxtlı-vaxtsız bir gün hamı enəcək
Zaman adlı kəhərindən dünyanın.

Yaşasaq da, mənasını duymuruq,
Boş ötüşən bir anına qıymırıq.
Şirinsə də, acısa da, doymuruq
Bir ömürlük zəhərindən dünyanın.

Neçə hayçı məğlub oldu bu hayda,
Kimi keçdi, kimi batdı bu çayda.
Ha deyirik, ha yazırıq – nə fayda,
Bu qəmindən, qəhərindən dünyanın...

Namiq, haqdan ömür istə sözünə,
Xoş niyyətin qoy nur olsun gözünə.
Səbr dilə, dözüm dilə özünə
Hər açılan səhərindən dünyanın.

YUBİLEY

## Sərraf ŞİRUYƏ – 70



*Sücaət və Şiruyə*

Hacıyev Şiruyə Həsən oğlu 1942-ci il sentyabrın 11-də Göyçə mahalının Basarkeçər rayonunun Daşkənd kəndində şair Həsən Xəyallının ailəsində anadan olub. Uşaq çağlarından atasından ərəb və fars dillərində yazıb-oxumağı öyrənən Şiruyə elə ilk məktəb yaşlarından şeirə böyük maraq göstərmişdir.

1960-cı ildə Bərdə rayonunun Yeni Daşkənd kənd orta məktəbini bitirdikdən sonra, 1962-ci ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə daxil olub və 1968-ci ildə oranı bitirmişdir. Həmin ildən Bərdə rayonunun Yeni Daşkənd kənd orta məktəbində müəllimlik etmişdir.

1972-ci ildən 1980-ci ilə kimi Yeni Daşkənd kənd orta məktəbində direktor müavini və Bərdə rayonu "Bilik" cəmiyyətində mühazirəçi işləmişdir. 1993-1997-ci illərdə dini mədrəsəni bitirmişdir.

Sərraf Şiruyə 1992-ci ildən 1996-cı ilə kimi döyüş bölgələrində hərbi jurnalist kimi fəaliyyət göstərmişdir. İgid döyüşçülərimizin qəhrəmanlığından bəhs edən və vətənpərvərlik mövzusunda 15-ə yaxın poemanın müəllifidir.

Erkən yaşlarından yaradıcılığa başlayan Sərraf Şiruyə 1962-ci ildən dövri mətbuatda şeirləri ilə çıxış edir və yazdığı şeirlər pərəstişkarlarının dillər əzbəridir. "Ağlama bülbül, ağlama"(1994), "Ölümdən sonrakı ömür"(1997), "Bu ocağın odu sönməz"(1998), "Cəsurlar"(2000), "İgid ölər, adı qalar"(2002), "Ayrılığın sonu varmış"(2006), "Könlüm Göyçəni istər"(2006), "Tərtərin yaralı cəngavərləri"(2006), "Mən haqqa sığınmışam"(2007), "Hər görüş bir xatirədir"(2007), "Göyçədən gələn səslər"(2008) və "Seçilmiş əsərləri" (on cild nəzərdə tutulub, hələlik altı cildi çap olunub) kitabları cəmi 18 min tiraj olmaqla çap olunmuşdur.

Hal-hazırda Bərdə rayonunun Yeni Daşkənd kəndində yaşayır və ədəbi fəaliyyətini davam etdirir. Azərbaycan Yazıçılar Birliyinin və Azərbaycan Jurnalistlər Birliyinin üzvü, "Qızıl Qələm", "Məmməd Araz" və "H.B.Zərdabi" mükafatları laureatıdır.

Vətənpərvərlik mövzusunda yazılmış şeirlərinə və poemalarına görə 15 noyabr 2007-ci ildə "Qarabağ Müharibəsi Əlilləri, Veteranları və Şəhid Ailələri İctimai Birliyi"nin "Fəxri Fərman"ı ilə təltif edilmişdir.

**POEZİYA**



**Sərraf ŞİRUYƏ**

## O NARA
***Təcnis***

Ələsgər lazımdı yaza vəsfini,
Qiymət qoya sinən üstə o, nara.
Yüz bağban tər töküb bəslədiyi nar,
Bənzər olmaz sən bəsləyən o nara.

Hüsnünün tərifi sığmaz bir bəndə,
Yüz ilgəyin düyünlənib bir bəndə.
Sən xanım ol, mən xidmətkar bir bəndə
Açım ilgəkləri qalsın on ara.

Şiruyəyəm, daşıb səbir qazanım,
Ay zalımım, mənə qəbir qazanım,
Bir busə ver, mən də xeyir qazanım,
Məni atma bu atəşə, o nara.

## YARIYA SARI
***Təcnis***

Gözəl, baxışların qan eyləyibdi,
Gətir dəsmalını, yarıya sarı.
Əlbəttə, sağalar könül yarası,
Təbib qarşı gəlsə yarıya sarı.

Gəzmişəm vətənin yaxşı dağını,
Görmüşəm həsrətin yaxşı dağını,
Çəkdi sinəsinə Yaxşı dağını,
Zəmanə qoymadı yarıya Sarı.

Şiruyəyəm, yar sirrini, yar açmaz,
Yolun azıb, sərhəddini yar aşmaz.
Səy zarafat, pis ad mənə yaraşmaz.
Daha ömür gedir yarıya sarı.

## BU YURDDA

Biz gül əkib, gül becərib, gül umduq,
Niyə alaq, ot göyərib bu yurdda?
Nə tilsimdi, nə cadudu görəsən,
Su quruyub, od göyərib bu yurdda.

Hamı ümid, gümanını itirib,
Bir-birinə inamını itirib.
Kök, nəsil, soy öz tamını itirib,
Özgə oxşar dad göyərib bu yurdda.

Mat qalmışam yoxdu canda hənirti,
Heç göyərmir umduğumuz göyərti.
İnsan verməliydi axı cücərti,
Cin, fəriştə - zad göyərib bu yurdda...

Bu dünyanın sirri varmış nə yaman,
Qorxmaq gərək bu sehirdən, ay aman!
Bu torpaq müsəlman, toxum müsəlman
Bəs niyə bəzzad göyərib bu yurdda?!

Şiruyə, dönübmüş fələyin çarxı,
Zir-zibil gətirib çayları, arxı.
Biz palıd toxumu əkmişdik axı,
Bəs niyə batbat göyərib bu yurdda?

LAÇIN FOLKLORU

## GÜLMƏCƏLƏR

### İMİŞLİDƏ TƏK SƏBİR[1]

Malıbəyli Zəkəriyyə Laçında özünü daha çox ticarətçilərdən şikayət edən kimi tanıtdırmışdı. Bir dəfə də mağazaların birində aldadıldığını zənn edən Zəkəriyyə Laçında şikayət etməkdən vaz keçir. Qara-qışqırıqdan sonra şikayət etmək üçün Bakıya gedən maşınlardan birinə əyləşib Laçından çıxır. Gün əyiləndə "Poçtun arasında" başqa bir maşından düşən Zəkəriyyədən niyə tez qayıtdığının səbəbini soruşanlara cavabı belə olur:

– İmişlidə tək səbir gəldi, geri qayıtdım.

### BEKARÇILIQ

*"Laçın folkloru" kitabı işıq üzü görəndən bir neçə gün sonra bu gülməcəni əslən Sahbuzun Nurs kəndindən olan Bəxtiyar adlı səxs Londondan zəng edib mənə danışdı. Yazı onun dilindən verilir.*

Laçının Ərikli kəndindən olan dostum Zülü ilə onun Qaxda qaçqın yaşayan bacısıgilə qonaq getmişdik. Yeznə hinduşka kəsmişdi. Yaxşı kabablayandan sonra üzümü dostumun yeznəsinə tutub soruşdum:

– Qardaş, nə ilə məşğul olursan, nə sənətin sahibisən?

Yeznə ağzını açmamış Zülü onu qabaqladı:

– Allah ermənilərin evini yıxsın, Laçında oğurluq edirdi, ta indi bekardı.

### TUMANÇAX[2]

Bir il Əriklidən Qarakişi adlı şəxsi xeyli toya dəvət edirlər. Kişi gedə bildiyi toya gedir, gedə bilmədiyinə nəmər yollayır. Toyların çoxluğundan kələyi kəsilən Qarakişiyə yenə bir dəvətnamə gəlir. Kənddən toya gedənlərə siyahı üçün bir göy beşlik uzadan Qarakişi toy sahibinə belə bir xəbər də yollayır:

– Orda deyərsiz ki, Qarakişi bu il tumançax qaldı!

### VAXTSIZ QONAQ

Qara Məmməd Ağdamın Üçoğlan kəndində dostunun evinə qonaq düşür. Məmmədi qarşılayan ev yiyəsi deyir:

– Vaxtsız oldu, sənə yemək hazırlaya bilmədik. Məmməd cibindən saatı çıxardıb ev yiyəsinə deyir:

– Saat ondu, saat ikiyə qədər sizi gözləyirəm!

---

[1] Söyləyəni: Həsənov Söhrab. Laçın şəhəri, Taxtakörpü qəsəbəsi.
[2] Söyləyəni: Cəbrayılov Ramil Əfqan oglu. Ələkçi kəndi.

## QALADA TUT SATAN

Bir laçınlı Qala (Şuşa) bazarında iki səbət tut satırmış. Bir qalalı ona yaxınlaşıb bir manat uzadır və deyir:

– Al bu manatı, mən səbətdən tut yeyəcəm!

Pulu alan laçınlı fikirləsir ki, qalalı bir az tut yeyib doyar. Qalalı səbətin birini qənşərinə çəkib başlayır tutu ovuclayıb yeməyə. Bir az keçəndən sonra tut satan baxır ki, qalalı tutu ovuclayıb yeyir, səbət yarıdan keçib. Laçınlı ona deyir:

– Qardaş, tutu heylə yemirlər.

– Bəs necə yeyirlər? – qalalı soruşur.

– Bir-bir saplağından tut qoy ağzına – laçınlı həm deyir, həm də tutu yeyərək qaydanı göstərir.

Qalalı qayıdır:

– Bilirəm, əmoğlu, ikinci səbəti həylə yeyəjəm!

## MÜDRİK CAVAB[1]

Bir evə qonaq gəlir, uşaq çıxıb qonağı qarşılayır. Qonaq soruşur:

– Atan evdədi?

– Atam meşəyə oduna gedib – uşaq cavab verir.

– Oğul, gec gələr, tez gələr? – qonaq yenə soruşur.

Uşaq cavab verir:

– Gəzi gen götürsə tez gələr, dar götürsə gec.

(**Açması:** Yəni odun doğrayan balta ilə ağacı kəsdiyi yeri gen götürsə tez kəsər, dar götürsə gec).

## ÇARIQLI-PATAVALI BƏY[2]

Qarıqışlaqdan qonşu kəndə bir qız qaçırırlar. Qız bəyin adamları tərəfindən qaçırılır. Bu vaxta qədər qız bəyin üzünü də görməyibmiş. Qızı gətirib evdə bir otağa qoyub çıxırlar cölə. Gəlinin yanında əynində köhnə pal-paltar geymiş bəy qalır. Qız oğlanı tanımadığı üçün, həm də içində belə birisinə qaçırılmaz xəyalı ilə ondan soruşur:

– Sən də bu evin adamısan?

Ürəyi tıppıltıynan döyünən bəy başını qaldırmadan cavabında deyir:

– Niyə mən Qarıqışlağın çarıqlı-patavalı kişilərindən pisəm?!

---

[1] Söyləyəni: Quliyev Atamoğlan Müzəffər oğlu. Alxaslı kəndi, Alxaslı yatagı.

[2] Söyləyəni: Mirzəyev Ələsgər Cəfər oğlu. Qarıqışlaq kəndi, Qarıqışlaq yatagı.

## AT OĞRUSU[1]

Mayıs kəndində bir məşhur at oğrusu olur. Kənddə bir kişinin atına gözü düşür. Fikirləşir ki, atı necə oğurlasın. At yiyəsi həmişə atla gedib Hoçazın meşəsində odun eləyirmiş, gətirirmiş evinə. Bir gün yenə at sahibi meşədə odun eləyir. Oğru da aralıda dayanıb bunu güdür. Kişi odunu ata yükləyib cilovundan tutub gedir, heç arxaya da baxmır. Oğru lüt soyunub arxadan yaxınlaşır ata, cilovu atın başından çıxardıb keçirir öz başına. Bu minvalla xeyli gedirlər. Oğru görür ki, kişi heç dayanmır. Axırda özü dayanır. Kişi – at!, at!, – deyib geri baxır. Lüt kişini görəndə zəhribağrı yarılır, cilovu əlindən yerə atıb kəndə qədər çığıra-çığıra qaçır.

## QUŞÇUDA BÜSAT[2]

Qarıqışlaq kəndindən bir kişi gecələr Quşçu kəndinə gedib sarsaq işlərlə məşğul olurmuş. Bir gecə Quşçunun kişiləri bunu tutub möhkəm döyürlər. Yaralı halda evə dönən Qarıqışlaqlı evdə xeyli müddət yatır. Bunun döyüldüyünü Quşçuda bilsələr də, Qarıqışlaqda bilən olmur. Yaraları sağalandan sonra Qarıqışlaqda "Su yalı" deyilən yerə camaatın içinə çıxır. Görür bundan heç nə danışmırlar. Ürəyi durmur, özü deyir:

– Kişilər, o günü gecə Quşçuda büsat varıdı.

Deyirlər, ə, nə büsatıdı?

Deyir:

– Birin yaman bərk döyürdülər, canınız üçün lap mitilinə çırpırdılar.

## DƏYİRMANA GEDƏN[3]

Bir nəfər dən dolu dağarcıqları yükləyir eşşəyə, sürür dəyirmana. Gedib görür ki, dəyirmanda heç kim yoxdu, dəyirman sabah işləyəcək. Eşşəyi qapıda qoyub gedir dəyirmanın suyunu döndərir ki, özü dəni üyütsün. Geri qayıdır ki, dən yüklü eşşək yoxdu. Boş dəyirmanı işləyə-işləyə qoyub eşşəyin dalınca kəndə qayıdır. Gəlib görür ki, it ağız atıb dağarcıqları dağıdıb, dən tökülüb yerə. Eşşəyi qatır qabağına gəlir dəyirmana ki, dəyirman qırılıb. Bu dəmdə dəyirmançı böyürdən çıxıb dəyirmanı qırdığı üçün kişini bərk döyür.

---

[1] Söyləyəni: Mirzəyev Ələsgər Cəfər oğlu. Qarıqışlaq kəndi, Qarıqışlaq yatagı.
[2] Söyləyəni: Mirzəyeva Minaya İbiş qızı. Qarıqışlaq kəndi, Qarıqışlaq yatağı.
[3] Söyləyəni: Mirzəyeva Minaya İbiş qızı. Qarıqışlaq kəndi, Qarıqışlaq yatağı.

## BAYATILAR

Bu yerlər əyəndimi,[1]
Düzdümü, əyəndimi.
Qardaş, uca boyunu
Qara yer bəyəndimi?!

Yük üstə kilim yandı,
Od tutdu kilim yandı.
Mən səni ağlamaqdan
Ağzımda dilim yandı.

Gəl məni qurdalama,
İri kəs, xırdalama.
Mən bir qaynar qazanam,
Kösöyü qurdalama.

Dəyirmana pər dəydi,
Pərgar uçdu, pər əydi.
Anamın şax qamətin
Fələyin özü əydi.

İlan, ilan, talx ilan,
Başın götür qalx ilan.
Bizə Fələk eylədi,
Nə işimiz xalxınan.

Dağlarda yaz olduğun,
Güllər pərvaz olduğun.
Nə sən bildin, nə də mən,
Ömrünün az olduğun.

Qardaş, qardaş, ay qardaş,
Qaşı-gözü yay qardaş.
Ölsə bacılar ölsün,
Heç deməsin "vay qardaş".

Bağında gül biçərdim,
Gülü güldən seçərdim.
Sənə köməyi olsa
Gözlərimdən keçərdim.

Qardas, haran ağrıyır?!
Dəymə, yaram ağrıyır.
Əlini qoy sinəmə,
Deyim haram ağrıyır.

Bağında var badamı,
Əkdim bitdi badamı.
Gəl qapımda durginən,
Desinlər var adamı.

Limonam, soyma məni,
Dər, yerə qoyma məni.
Cavanam, ömrüm azdı,
Məzara qoyma məni.

Dolaylar niyə çəndi,[2]
Könlüm evi üşəndi.
Söykənim Tək armuda,
Tək armud da Vətəndi.

Aşıq, zamana gələ,
Simlər kamana gələ.
Qaçqın dönə elinə,
Dinə-imana gələ.

**Toplayanı:**
**İlham QƏHRƏMAN**

[1] Söyləyəni: Quliyeva Rüzgar Nurəddin qızı, Alxaslı kəndi, Alxaslı yatağı (11 bayatı)

[2] Söyləyəni: Mirzəyeva Minayə İbiş qızı, Qarıqışlaq kəndi, Qarıqışlaq yatağı (2 bayatı)

**KİTAB RƏFİ**

## “ÖMRÜN ŞƏHİDLİK ZİRVƏSİ”




Bu günlərdə “Elm və təhsil” nəşriyyatında nəfis tərtibatda “Ömrün şəhidlik zirvəsi” adlı kitab çap olunub. Kitabın məsləhətçisi professor Azər Kərimov, toplayıb tərtib edəni və redaktoru isə Araz Yaquboğludur.

Kitab Qarabağ müharibəsində şəhid olmuş Kərimov Yasif Fəzi oğlunun əziz xatirəsinə həsr olunmuşdur. Kitabda şəhidin babası, Rəsullular nəslinin igid el qəhrəmanı, sərkərdə Məşədi Qasımın XX əsrin əvvəllərində ermənilərə qarşı mübarizədə göstərdiyi qəhrəmanlıqlar, II Dünya Müharibəsində Rəsullular nəslindən həlak olan və itkin düşənlər haqqında da geniş məlumatlar verilmişdir. Əsgər sülaləsi olan Məşədi Qasımın iki nəticəsi – Abbas Qasımov, Nəbi Zeynalov, bu kökdən olan şəhidlər – Ziyafət Balıyev, Mehdi Məhərrəmov və Rəsul İlyasov haqqında da kitabda məlumatlar öz əksini tapmışdır. Qeyd edək ki, Bərdə rayonu Yeni Daşkənd kənd tam orta məktəbi hazırda şəhid Yasif Kərimovun adını daşıyır. 2012-ci ildə məktəbin girişində şəhidin büstü qoyulmuşdur.

Tədqiqatçı Araz Yaquboğlunun bu kitabda çap olunan “Adı dastanlaşan el qəhrəmanı” adlı məqaləsinin bəzi hissələrini də burada verməyi lazım bildik.

Laçınlı Sultan bəyin silahdaşı olan, dövrünün cəsur igidlərindən sayılan Rəsulov Məşədi Qasım Hacı Kərim oğlu 1863-cü ildə Göyçə mahalının Daşkənd kəndində Rəsullular nəslində anadan olub. O, Göyçə mahalında çox hörmətli, adlı-sanlı şəxsiyyətlərdən biri, eyni zamanda erməni daşnaklarının hücumlarına qarşı xalqı səfərbər edən başbilən kişilərdən olmuşdur.

Məşədi Qasım Göyçə mahalındakı döyüşlərdən sonra ailəsi ilə birlikdə Qarabağa gəlmiş, Laçınlı Sultan bəyin silahdaşı olmuş və erməni millətçilərinə qarşı qəhrəmanlıqla vuruşmuşdur. Laçınlı Sultan bəylə Məşədi Qasımın tanışlığı Göyçənin ağır günlərində Sultan bəy Göyçəyə – Basarkeçərə, Zoda köməyə gələrkən olmuşdur. Məşədi Qasımda ermənilərə qarşı qisasçılıq istəyi və Sultan bəyin də ermənilərə qarşı apardığı mübarizə Məşədi Qasımın Qarabağa gəlməsinə səbəb olmuşdur. O, sərrast atıcı kimi 1919-cu ildə Qarabağda baş verən hadisələrdə xüsusi fəal-

lıq göstərmişdir. Bir il Sultan bəy və qardaşı Xosrov bəyin məsləhəti ilə kəndin vergisi də ona verilməklə Xocalı ətrafında bir kənddə (deyilənlərə görə Ağdamın Qasımlı kəndi) yaşamışdır. 1921-ci ildə Məşədi Qasım orada qızdırmadan vəfat etmişdir və dostu Məmmədquluya etdiyi vəsiyyətinə əməl olunaraq Şuşa şəhərində dəfn olunmuşdur. Məşədi Qasımın vəfatından sonra qardaşı Kərbəlayı Əmrah Qarabağa gələrək onun uşaqlarını doğma ata-baba yurdları Göyçəyə aparmışdır.

Məşədi Qasımın həyat-fəaliyyəti haqqında dövri mətbuatda və kitablarda çox yazılmışdır. Onun haqqında hesab edirik ki, ən müfəssəl, doğru məlumatları nəvəsi Xasay Zeynalov "Göyçə mahalında 1917-1920-ci illərin hadisələri" məqaləsində yazmışdır. Daha iri həcmli məqalə isə Eldar Həsənlinin "Göyçəli sərkərdə Məşədi Qasımın Əsgəran döyüşü" adlı məqaləsidir. Lakin müəllif məqalədəki məlumatlarda bəzi təhriflərə yol vermişdir.

Məşədi Qasımın XX əsrin əvvəlində ermənilərə qarşı apardığı mübarizəni həmin əsrin sonlarında onlarla nəvə-nəticələri də davam etdirdilər. Onlardan nəvəsi Yasif, nəticələri Abbas və Nəbi Qarabağ döyüşlərində şəhidlik zirvəsinə ucaldılar.

**ARAŞDIRMA**

## II DÜNYA MÜHARİBƏSİNDƏ HƏLAK OLAN LAÇINLILAR…

**Novruzov Qarakişi İbrahim oğlu** 1910-cu ildə Laçın rayonunun Ağbulaq kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağrılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Muradxanov Hümbət Rəhim oğlu** 1919-cu ildə Laçın rayonunun Ayıbasar kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağrılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Nəsibov İsa Çərkəz oğlu** 1920-ci ildə Laçın rayonunun Ayıbasar kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağrılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Nəsibov Rəsul Ələsgər oğlu** 1919-cu ildə Laçın rayonunun Ayıbasar (bəzi mənbələrdə Ağanus) kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağrılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Nəbiyev Hidayət Dadaş oğlu** 1914-cü ildə Laçın rayonunun Alxaslı kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Mustafayev İsa Mikayıl oğlu** 1918-ci ildə Laçın rayonunun Türklər kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Mustafayev Ocaqverdi Seyfi oğlu** 1914-cü ildə Laçın rayonunun Tərxanlı kəndində doğulmuşdur. 1942-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Nuriyev Teymur** 1910-cu ildə Laçın rayonunun Tərxanlı kəndində doğulmuşdur. Sıravi əsgər, 1 aprel 1943-cü ildə əsirlikdə ölmüşdür.

**Müftiyev Həsən Həmzə oğlu** 1921-ci ildə Laçın rayonunun Mollalar kəndində doğulmuşdur. Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər, 24 may 1942-ci ildə həlak olmuşdur.

**Mustafayev Məhəmməd Nəsib oğlu** 1913-cü ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər, həlak olmuşdur.

**Namazov Həsən Sevdimalı oğlu** 1901-ci (1910-cu) ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər, 62-ci dəniz atıcı briqadasının avtomatçısı 9 yanvar 1943-cü ildə həlak olmuşdur. Rusiya Federasiyasının Şimali Osetiya Respublikasında dəfn edilmişdir.

**Qələndərov Elmar Süleyman oğlu** 1921-ci ildə Laçın rayonunun Minkənd kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Serjant, 8 aprel 1944-cü ildə həlak olmuşdur. Odessa vilayəti Prosulovsk rayonunda dəfn edilmişdir.

**Qasımov Qasım Qaraca oğlu** 1921-ci ildə Laçın rayonunun Zağaaltı kəndində doğulmuşdur. 1941-ci ildə Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər, 343-cü atıcı diviziyanın avtomatçısı 22 may 1942-ci ildə həlak olmuşdur. Xarkov vilayətinin İzyum şəhərində dəfn edilmişdir.

**Mənbə:**

• Azərbaycan Respublikası Xatirə Kitabı, III cild, Q hərfi, Bakı, 2001
• Azərbaycan Respublikası Xatirə Kitabı, XI cild, M, N hərfi, Bakı, 2011

*Hazırladı*: **Araz YAQUBOĞLU**

**POEZİYA**



## Zakir ŞƏHRİYAZ

### YURDUMA

Bilmirəm can deyim, ya layla çalım,
Düşmən tapdağında qalan yurduma.
Bayatımı deyim, ağımı deyim,
Sinəsi pərişan olan yurduma?!

Qara buludlardı üstünə çökən,
Həsrəti olubdur qəlbimi sökən.
Səhərlər gözünü yollara dikən,
Axşamlar boşalıb-dolan yurduma.

Şəhriyaz, nə ola bir günlük görəm,
Sevinə yamacım, şadlana dərəm.
Qüdrətim də çatmır təskinlik verəm,
Payızda saralıb-solan yurduma.

### MƏN ORDA

Nə qayğı bilərdim, nə dərd, nə kədər,
Adam kimi dolanardım mən orda.
Ömür əriməzdi boş yerə hədər,
Toz-torpağa bulanardım mən orda.

Onda oturardım ətək üstündə,
Əllər nazlanardı çiçək üstündə.
Otların içində pətək üstündə,
Arı kimi yalanardım mən orda.

Şəhriyazam, uzaq gəzdim axmaqdan,
Yandırardım onu oda yaxmaqdan.
Gözlərim doymazdı gözə baxmaqdan,
Tamahlanıb sulanardım mən orda.

### DALDALANDI

İqbal küskün oldu, bəxt oyanmadı,
Bu sərraf gözümdən göz daldalandı.
Aqil söhbətini naşı korladı,
Pünhana çəkildi düz, daldalandı.

Hikmət məclisinə dəli tapdılar,
Başın tumarlayıb başa dartdılar.
Həya pərdəsini elə atdılar,
Gözəllər utandı, üz daldalandı.

Şəhriyaz, xeyri yox ha yaz, ha döşə,
Didişməyi gündə etdilər peşə.
Mövlamız deyənlər keçmədi işə,
Sənət gözdən düşdü, söz daldalandı.

### YANAĞINA

Özgəsi deyiləm, sən daldalama,
Tamarzı qalmasın göz yanağına.
Biz qoşaca dursaq dünya dağılmaz,
Yaxın gəl söykənsin üz yanağına.

Eşqin atəşinə oldum alışan,
Həsrətdən ürəyim tez oldu şan-şan.
Kürəyində niyə olsun pərişan?
Hərdən bir telini düz yanağına.

Şəhriyazam, hansı gülə bənzədim,
Darçına, mixəyə, hilə bənzədim.
Gövhərə bənzədim, lələ bənzədim,
Mən deyim yaraşsın söz yanağına.

ŞƏHİDLƏRİMİZ

## ERMƏNİLƏR BAŞINA QİYMƏT QOYMUŞDULAR



***Kimsənəmdi,***
***Kim şahdı, kim sənəmdi.***
***Gizli ağla, gözlərim,***
***Bilməsin kimsə nəmdi.***

Süleymanov Ələddin Süleyman oğlu 1958-ci il iyun ayının 15-də Sultan bəy, Xosrov bəy yurdu Laçının Vağazin kəndində anadan olmuşdur. Uşaqlıq illəri dağlar qoynunda keçən, laçın kimi yalçın qayalarda qıy vuran Ələddin boya-başa yetdikcə başa düşürdü ki, yüksək, ən ülvi məhəbbət torpağa bağlılıqdı. Antey kimi göy qübbəsini çiynində saxlayan oğullar torpaqdan güc-qüvvət alır. Belə oğullardan biri də Sultan bəy idi. Bütün laçınlıların and yeri Sultan bəy. O Sultan bəy ki, tayqulaq Andronikin qaniçən qoşununun Qarabağa girməsinə imkan verməmişdi. Sultan bəy, qardaşı, Şuşa qubernatoru Xosrov bəy haqqında qocaların söhbətlərinə qulaq asa-asa böyüyən Ələddin özü də dönüb güc-qüvvət, yenilməzlik rəmzinə çevrildi.

Ələddin doğma kəndlərində orta təhsil alandan sonra Bakıya gəlir, 8 №li dəmir-beton zavodunda işləyir, oradan da hərbi xidmətə yollanır. Düşənbənin hərbi raket hissəsində qulluq edir. Sonra Bakıya, iş yerinə qayıdır. Moskvaya gedir. “Şərəf nişanı” ordenli Kənd Təsərrüfatı İnstitutuna daxil olur. Ələddin 1993-cü ildə yenidən Bakıya qayıdır, “Xəzərdənizneftqaz” inşaat trestinin 2 №li tikinti-quraşdırma idarəsində işə düzəlir. Üç aydan sonra, yəni 23 noyabr 1993-cü ildə milli ordu sıralarına qoşulub azğın düşmənlə vuruşa gedir. Tərtər bölgəsində onlarla yağını məhv edir. Ermənilər onlara qan udduran bu igidi min bir fənd-fellə aradan götürməyə çalışır, onun başına qiymət qoyurlar. Bunu eşidən Ələddin “baş yiyəsi ölmüşdü, onu düşmən əlinə verə” – deyir. Lakin dekabrın 30-da keçirilən həlledici döyüşlərin birində Ələddinin Vətən məhəbbəti, el yanğısı ilə döyünən ürəyi düşmən gülləsinə hədəf olur.

Ələddin Bakının Şəhidllər xiyabanında dəfn olunub. Tez-tez onun məzarı üstə iki körpəsi ilə dayanıb fikrə gedən bir gəlin görünür. O gəlin Ələddinin ömür-gün yoldaşı Pəri, bir cüt körpə isə oğulları Süleyman və Zahiddir.

Hər dəfə o gəlini görəndə istəyirəm qışqırıb deyim:

– Bəsdi, bacım, bəsdi, sil göz yaşını, dik tut məğrur başını! Sənin Ələddinin handabir oğullardan idi, Vətən yolunda yüz canı olsa bircəciyini əsirgəməyən oğul. Elə oğulların yeri behişt, ünvanı bu yurdun özü boyda qəlbidi. Azadlıq yanğısıyla odlanan qəlbi.

**Elbrus ŞAHMAR,**
***"Şah İsmayıl qartalları" kitabı,***
***Bakı, 1996***

**PUBLİSİSTİKA**

**İmdad ƏLİZADƏ**

## YOL AĞRISI
### (IV yazı)



1993-cü il martın 31-də bacılarım Turac və Rəhiməni, qardaşlarım Mirzə və Xıdırı Oğuldərədən maşınla yola salmışdıq. Onda böyük bacım Turacın 14, Mirzənin 10, Rəhimənin 8, Xıdırın isə 5 yaşı vardı. Onların da yolu asan olmayıb. Yazının bu hissəsini bacım Turac nəql edib.

***

"Qaz-52" markalı köhnə yük maşını adamla dolu idi. Kənddən xeyli uzaqlaşandan sonra, Sarıyoxuşda piyada gedən bir neçə qadın-uşaq da maşına mindi, hamı ağlayıb bir-birinə qarışmışdı. Sarıyoxuşu enəndə maşın xarab oldu.

Biz gözlədiyimiz müddətdə Laçının başqa kəndlərinin sakinlərini aparan bir "UAZ" və "KAMAZ" ötüb keçdi. Bu maşınlar da qadınla, uşaqla dolu idi. Günortaya yaxın Tirkeşəvənd kəndinə çatdıq. Kənd boş idi. Yalnız yolun kənarında ikimərtəbəli evdə iki qadın və üç kişi qalmışdı. Onlar da evdə olan əşyaları yığırdılar, getməyə hazırlaşırdılar, dedilər ki, tirkeşəvəndlilər iki gün əvvəl gedliblər.

Maşında olan ağsaqqallar burada dayanmağın mümkün olmadığını söylədilər. Kəlbəcəri iki hissəyə bölən tuneldən keçmək lazım idi. Lakin tuneldə vəziyyətin necə olduğunu bilmirdik. Tirkeşəvənddə olanda öyrəndik ki, ermənilər Ağdərə istiqamətindən hücuma keçiblər, Tərtər çayı boyunca Kəlbəcərə tərəf irəliləyirlər.

Ermənilər bu əraziləri tam tutmasa da, oradan keçmək təhlükəli olduğuna görə belə qərara gəlindi ki, tunel istiqamətində gedilməsin. Başqa yol seçildi. Bu yol tuneldən aralı keçirdi. Sürücü yola o qədər də bələd deyildi. Maşın dağlara qalxdı, tuneldən xeyli aralı palçıqlı və qarlı yollardan keçdik. Tuneldə şiddətli döyüş gedirdi. Nə qədər aralı keçsək də, atəş səsindən qulaq tutulurdu.

Maşın dayandı. Sürücü özünü itirmişdi. Yolu tanımırdı. Bu zaman səmada təyyarələr göründü. Erməni hərbi təyyarələri idi, tuneli bombalayırdı. Nə edəcəyimizi bilmirdik. Sürücü maşına qalxdı, sürətlə yaxınlıqdakı meşəyə doğru sürdü. Ərazidə Azərbaycan ordusunun əsgərləri vardı. Əsgərlər uzaqdan bizi səslədilər ki, maşından düşüb yerə uzanın. Burada insanı dəhşətə gətirən vəziyyət yaranmışdı. Elə bildik ki, hər şey qurtardı, ermənilər bizi ya öldürəcək, ya da əsir aparacaq. Hamı ağlayırdı.

Maşın meşəyə çatmamış dayandı. Qardaşlarımı və bacımı maşından aşağı endirdim, əllərindən tutub meşəyə doğru qaçdıq. Ağacların arasında gizləndik. Maşının kabinəsində yaşlı qadınlar oturmuşdu. Onların yanında körpə bir uşaq vardı. Yaşlı qadın uşağı anasına tərəf tulladı ki, qaç meşədə gizlən. Anası uşaq qucağında meşəyə tərəf qaçdı. Yolda yoruldu, üzüstə uzandı. Uşağı düşmən gülləsindən qorumağa çalışırdı.

Təyyarə göydə bir neçə dəfə manevr edib ərazini bombaladı və getdi.

Atamın bibisi oğlu Sərdar İbrahimov gəlib çıxdı. Atamı, anamı soruşdu. Dedim ki, kənddə qalıblar. Sərdar dayı ağladı, buradan sağ çıxmaq üçün Allaha yalvardı. Xeyli gözlədikdən sonra maşına tərəf qayıtdıq, maşına yığılıb yola düşdük. Hamı qorxu içində idi, uşaqlar ağlayırdı, Xıdırın rəngi ağarmışdı.

Bir qədər yol gəldik, bir neçə kənddən keçdik. Qaranlıq düşmüşdü. Gecə bir kənddə qaldıq. Bir evin qarşısına gəldik. Evdə qoca bir kişi vardı. Bizi evə qoymurdu, deyirdi ki, gedin başqa evdə qalın. Amma bizim getməyə başqa yerimiz yox idi. Ev sahibi əşyalarının çoxunu aparmışdı. Evdə yalnız qırıq divan, paltar dolabı qalmışdı. Kişi dedi ki, uşaqlarım, yoldaşım iki gün əvvəl gediblər, oğlum qayıdıb məni də aparacaq. Bizi evdən qovurdu. Hətta Ənvər əmi divanda oturmaq istəyəndə kişi buna etiraz edir, icazə vermirdi. Lakin biz kişiyə o qədər də əhəmiyyət vermirdik. Bombardmanın qorxusu canımızdan çıxmamışdı.

Sonra məlum oldu ki, ev əşyalarının bir hissəsini bir otağa yığıb qapıları da mismarlayıblar. Ənvər əmi dedi ki, mən kişinin başını qatacam, səhərə qədər burada oturacam, özünüzə yer edin. Dolabdakı köhnə paltarı

yerə tökdük. Bacı-qardaşlarıma üç dəfə yer hazırladım, qadınlar əlimdən alıb başqalarına verdilər. Mən, bacı-qardaşlarım və bir neçə nəfər köhnə divanın üstündə gecələdik. Ənvər əmi səhərə qədər yatmadı.

Bu kənddə Qara adlı bir kişi vardı. O dedi ki, gündüz tuneldə Azərbaycan ordusuyla ermənilər arasında ağır döyüş olub, ermənilər tuneli tutublar, yol bağlanıb, Kəlbəcər və Laçın sakinlərini daşıyan bir neçə maşını partladıblar, sakinləri əsir aparıblar, günorta yolda bizi ötüb keçən maşınlardakı insanları qırıblar. Sürücülər ermənilərin tunelə yaxınlaşdığından xəbərsiz olub. Maşınlar sürətlə tunelə yaxınlaşanda ermənilər hər iki maşını vurub, insanların bir hissəsini qətlə yetirib, bir hissəsini əsir aparıb. Sonradan həmin maşında olan bir neçə qadın və uşaq əsirlikdən azad olundu.

Səhərə yaxın qaldığımız evə üç-dörd əsgər gəldi. Möhkəm qorxduq, elə bildik ermənilərdir. Əsgərlər dedilər ki, erməniləri tezliklə geri oturdacağıq.

Evin eyvanında odun vardı, odun gətirib sobanı qaladıq. Evdə çıraq yanırdı. Çırağın yanmasından narahat olduq, ermənilər işıq görüb gələ bilərdilər. Maşınımız qapıda dayanmışdı, bir neçə nəfər maşında qalmışdı.

Oğuldərədə qalanlardan isə xəbərimiz yox idi. Fikirləşdik ki, yəqin kənddə qalanları ermənilər qırıb, ya da əsir aparıb. Bu zaman uşaqlardan biri asqırdı. Hamı dedi ki, səbir etmək lazımdır.

Soba yandırıldığına görə ev çox isti idi, bərk yatmışdıq. Səhərə yaxın olardı. Birdən qadınlardan biri yuxudan ayıldı, sobanın içində olan kösövləri çıxarıb pəncərədən çölə atdı. Çünki evin bacasından tüstü çıxırdı, ermənilər evdə adam olduğunu bilərdilər. Qışqırıb dedi ki, tank səsi gəlir, hərbi texnika Kəlbəcər istiqamətində hərəkət edir, ermənilər qaldığımız evin yanınacan gəliblər:

– Ay Musa, ay Məcid, ermənilər qapıya qədər gəliblər, bizi qırdılar.

Qadının səsinə hamı yuxudan oyandı. Hamı ağlayırdı. Səkkiz yaşlı bacım Rəhimə yuxudan ayılan kimi qışqıra-qışqıra “Bacı, mən qaldım, məni də götür” dedi.

Gecə bir neçə maşın da bizim qaldığımız evin qarşısında dayanmışdı. Biz həyətə çıxanda gördük ki, həmin maşınlar gedib. Kənd ərazisində Azərbaycan ordusunun postu vardı. Postda dayanan əsgərlər qocaları, uşaqları maşına mindirməyə kömək etdilər, hamımız maşına mindik.

Ev yiyəsini qoyub getmək istəmirdik. Baxmayaraq ki, gecə bizi evə buraxmırdı. Sürücü, yaşlı kişilər nə qədər təkid etdilərsə, xeyri olmadı.

Bura insanların bir-birinə kömək etməsinə ən çox ehtiyac hiss edilən yer idi. Maşın işə salındı. Kişi həyətdə boynubükük dayanmışdı.

Oğuldərədən çıxanda anam maşına bir xurcun çörək, yemək qoymuşdu. Lakin elə vəziyyət yaranmışdı ki, yemək heç kimin yadına düşmürdü. Hamı ac-susuz idi. Maşın meşənin kənarı ilə getdi, bir kəndə çatdıq.

Yolda Laçının Dambulaq kəndindən olan xeyli qadına, uşağa rast gəldik. Bir hissəsi atlı, bir hissəsi piyada idi. Onları əvvəldən tanıyırdıq. Biz onlara yaxınlaşanda kürəyində körpə, yanında da üç körpə olan qadınlardan biri maşının qabağına qaçdı. Ağlaya-ağlaya özünü maşının qabağına atdı, sürücü maşını saxladı. Qadın əllərini yuxarı qaldırıb yalvarmağa başladı:

– Yorulmuşam, uşaqları apara bilmirəm. Bir dəfə piyada tunelə gedib qayıtmışıq, heydən düşmüşəm. Atın üstündə dayana bilmirəm. Məni burada qoyub getməyin, bu körpələri ermənilər qıracaq, yalvarıram, Allah xatirinə kömək edin.

Qadının naləsi ərşə dirənmişdi, adamın tükləri biz-biz olurdu.

Sürücünü qınamaq olmazdı. Maşın köhnə və nasaz idi. Amma qadını, uşaqları maşına mindirdi. Atın belindən iki kisə düşürdülər. Qadın kisələri maşına qoymaq istəyirdi. Sürücü özündən çıxdı:

– Köhnə, xarab maşındır. Maşını elə bil kürəyimdə aparıram. İndi hamınızı burada tökəcəm, özümü də öldürəcəm.

Amma qadın kisələri maşına qoymaqda israrlı idi və qoydu.

Meşənin qırağı ilə palçıqlı yolla gedirdik. Yol yoxuş idi. Birdən maşın sürüşüb sürətlə geri getdi. Sürücü maşına nəzarəti itirmişdi. Adamların naləsi ərşə qalxmışdı. Bir tərəfdən də dayanmadan atəş səsi gəlirdi. İnsanların qışqırığı ilə silah səsi bir-birinə qarışmışdı. Mirzəni, Rəhiməni, Xıdırı özümə tərəf çəkdim.

Maşın xeyli geri gedəndən sonra yolun içində olan bir çalaya düşüb dayandı. Sağ qaldığımıza görə sevindik, Allaha şükür etdik. Amma bu sevinc ötəri idi. Çünki sağ qalacağımıza hələ də ümidimiz yox idi. Düşməndən uzaqlaşa bilməmişdik, başımızın üzərindən ağır silahlarla atırdılar.

Sürücü bir qədər özünə gələndən sonra yolumuza davam etdik. Maşın çətinliklə dağı qalxırdı. Ayağı yer tutan yerə düşüb maşını itələyirdi, palçıqlı dağdan çıxmasına köməklik edirdi.

Maşın bir kəndə çatdı. Gecə yağış yağmışdı, kəndin yolları sarı palçıq idi. Bir qədər gedəndən sonra maşın kəndin ortasında palçığa batdı və onu çıxarmaq mümkün olmadı. Dayanmaq olmazdı, düşmən başımı-

zın üstünü almışdı. Maşında yeriyə bilməyən, iflic, yer xəstəsi olan Pəri İlyasova, yaşlılardan Ənvər İlyasov, Şərif İsgəndərov, Camal İsgəndərov, Məsudə İlyasova qaldı. Hamı gileylənirdi, ağlayırdı, buradan sağ çıxmaq üçün Allaha yalvarırdı.

Maşından düşüb piyada getməyə başladıq. Bir qədər gedəndən sonra bir yük maşını gəldi. Bizi bu maşına yığdılar. Dadaş İlyasov qucağındakı iki yaşlı nəvəsi Dadaşı göstərib dedi:

– Bu uşağı Allah üç dəfə imtahana çəkib, ata-anadan məhrum edib, babasının, nənəsinin ümidinə qalıb. Bir dəfə atası əməliyyat olunanda, ikinci dəfə ötən il qaçqın düşəndə, üçüncü dəfə də indi qaçqın düşəndə.

Dadaş İbrahimov bunu deyib ağladı.

Bu maşında bir qədər gedəndən sonra öz maşınımız arxadan gəlib çatdı. Yoldan keçənlərin köməyilə maşınımız palçıqdan çıxarılmışdı. Düşüb öz maşınımıza mindik.

Yolda dəhşətli mənzərə vardı. Qarlı və palçıqlı yolda piyada gedən qoca, uşaq, qadın, kürəyində yaşlı valideynlərini aparanlar, ağlayanlar, nəfəsini dərənlər, mal-heyvan...

Xeyli yol gedib bir kəndə çatdıq. Kənd meşənin qırağında yerləşirdi, ortasından çay keçirdi. Heç kim yox idi kənddə. Bu kənd də Kəlbəcərin digər kəndlərindən fərqlənmirdi – yiyəsiz mal-qoyun, sahibsiz itlər, ipdə qalan pal-paltar...

Sürücü bu ərazilərə bələd deyildi. Heç kim bu yolun hara getdiyini, bizim hansı istiqamətdə hərəkət etməli olduğumuzu bilmirdi. Sürücü maşını bir evin yanında saxladı. Düşüb bir evə girdi. Evdə heç kim yox idi. Sürücü geri qayıtdı, yolumuza davam etdik. Yolda piyada gedən insanlardan yolu soruşa-soruşa gedirdik.

Yolda maşınımız yenidən palçığa batdı. Yenidən düşüb piyada getməyə başladıq. Burada xeyli insan vardı – Kəlbəcərin müxtəlif kəndlərindən, əksəriyyəti isə Milli, Bağırlı kəndlərindən idi. Burada insanların çoxu itirdiyi doğmalarını soraqlayırdı. Mən də Oğuldərədə qalan atamı, anamı, qardaşlarımı axtarırdım. Qarşıma çıxan hər kəsdən Laçın rayonundan gələnin olub-olmadığını, ailə üzvlərimi görüb-görmədiklərini soruşurdum. "Gördüm" deyən olmadı.

Yaşlı qadınlar "Can bala, sən də adam axtarırsan, sənin nə yaşındır adam axtarasan. Bura qədər kimlə gəlmisiz, çalışın adamlardan geri qalmayın, buradan çıxın" deyib ağlayırdılar. Mən də kiminlə gəldiyimizi, bacı-qardaşlarımı göstərirdim. Mirzənin, Rəhimənin, Xıdırın əlindən tut-

muşdum, yanımdan uzaq getmələrinə imkan vermirdim, onları itirməkdən qorxurdum.

Yolumuza davam etdik. Xeyli gələndən sonra dəmir körpülü bir kəndə çatdıq. Dedilər ki, bura Yanşaq kəndidir. Bir qədər gəlib Murovun ətəyinə çatdıq. Maşın karvanı yolu bağlamışdı, tıxac yaranmışdı. Hamını maşından düşürdülər. Dedilər ki, gözləyəcəyik axşam olsun, şaxta yeri dondursun, maşın onda irəli gedə bilər, yeriyə bilən getsin, çalışın ki, bu dağı aşın, erməni arxadan gəlib bizə çata bilər, yoldan çıxmayın, insanların iziylə gedin, qara-palçığa batıb qalarsız.

Donub qalmışdım. Dedim ki, atamı, anamı gözləyəcəm, tək gedə bilmərik. Cavab verdilər ki, Oğuldərədə qalanlardan xəbər yoxdur, gözləmək olmaz, onların nə vaxt gələcəyi məlum deyil.

Bir ailənin vəziyyəti yadımdan çıxmaz. Bir ana yorğan-döşəyi öz kürəyinə bağlamışdı, balaca uşaqları da ev əşyaları ilə yükləmişdi. Uşaqlar toyuq-cücəni qoltuqlarına, malı, qoyun-keçini qabaqlarına qatıb aparırdı.

Murova qalxdıqca vəziyyət ağırlaşırdı. Hava şaxtalı idi. Yolda palçığa, qara batıb qalan, donub qırılan heyvan leşindən tərpənmək mümkün deyildi. Qadın uşaqlarından yolda yorulub qalan körpə quzuları, buzovları yolun kənarına çıxarmaq istəyirdi. Çünki onları maşınlar tapdayırdı.

Su donmuşdu, buzdan körpü yaranmışdı. Bacı-qardaşlarımı maşından düşürüb piyada yola düşdük. Bir xeyli gəlmişdik. Dadaş əmi arxadan gəlib çatdı. Dedi ki, iki öküz toqquşdu, Bəbirlə Rahiləni vurdu, ürəkləri getdi, vəziyyətləri ağırdır, yeriyə bilmirlər, onları yenidən maşına qaytardıq.

Yolda Sərdar dayını gördük. Rəhimənin ayaqlarında ayaqqabı yox idi. Yalnız yun corab vardı. Bacı-qardaşlarım uşaq olduqlarına görə artıq yeriyə bilmirdilər. Xıdırı kürəyimə alıb bir qədər irəli aparırdım, geri qayıdıb Rəhiməni götürürdüm, sonra qayıdıb Mirzəni aparırdım.

Sərdar dayı ağladı, atamgilin qarasına gileyləndi. Söylədi ki, üç körpəni də bir uşağa qoşub yola salarlar?.. Sərdar dayı dedi ki, Rəhimə belə ayaqyalın gedə bilməz. Bir qədər aşağıda Laçının Qorçu kəndinin sakinlərinə məxsus maşın vardı. Maşın Murovun bir neçə döngəsini qalxıb tıxacda dayanmışdı. Sərdar dayı dedi, Rəhiməni apar həmin maşına mindir. Rəhiməni aparıb maşına mindirdim. Xıdırla Mirzəni yenə də əvvəlki kimi kürəyimdə Murovu qaldırırdım.

Mirzə dedi ki, mənim ayağımda rezin çəkmə var, çətin də olsa gedəcəm. Aclıq, susuzluq, soyuq bizi taqətdən salmışdı. Beş yaşlı Xıdır acından ağlayırdı, çörək istəyirdi.

Bir qadın məndən haradan olduğumu, kiminlə getdiyimi soruşdu. Laçından olduğumu, balaca bacı-qardaşlarımla birgə getdiyimi, ata-anamın, iki qardaşımın Oğuldərədə qaldığını dedim. Qadın dedi ki, uşaqları itirərsən, yanlarından ayrılma. Qadın belə deyəndən sonra geri qayıtmaq, bacım Rəhiməni götürmək qərarına gəldim. Mirzəylə Xıdıra tapşırdım ki, burda dayanın, gəlirəm. Sərdar dayı da orada idi. Geri qayıtmağıma etiraz etdi, dedi ki, maşın bu gün Murovu aşacaq, Rəhiməni də gətirəcək, geri qayıtma.

Xeyli geri qayıdıb Rəhiməni götürdüm. Rəhimə aralıdan məni görəndə ağlaya-ağlaya çağırdı: “Bacı, mən burdayam”.

Maşında olan qadınlar Rəhiməni aparmağıma etiraz etdilər. Dedilər ki, ayaqyalın uşağı hara aparırsan. Onlardan ayaqqabı istədim. Dedilər ki, yoxdur. Rəhiməni kürəyimə alıb geri qayıtdım. Rəhimə bir neçə dəfə dedi ki, məni qoy yerə, yeriyim, Xıdırı götür. Amma ayaqqabısız olduğuna görə onu kürəyimdən yerə qoymadım.

Sərdar dayı Xıdırın, Mirzənin əlindən tutmuşdu. Rəhiməni kürəyimdən düşürmürdüm. Xıdır tez-tez dayanırdı. “Yoruldum, bir az dayanaq” deyirdi. Dayanan kimi aşağı çökürdü, qarın üstündə otururdu, acından ağlayırdı. Yoldan keçən bir neçə adamdan çörək istədim. Bir nəfər para çörək verdi, Xıdırın əlinə bir parça çörək verdim. Onu dilə tuturdum. “Sən dayansan, bacın da dayanacaq. Ermənilər gəlib bizə çatacaq. Bir az da gedək, çatmışıq” deyirdim. Xıdır əllərini dizlərinin üstünə qoya-qoya gedir, dayanır, yenidən yola davam edirdi.

Murovu qalxmaq asan deyildi. Acından, susuzluqdan dizimizdə taqət qalmamışdı. Elə hey qar yeyirdim. Yolda bir bulaq vardı. İnsanlar su içmək üçün növbəyə dayanmışdı. Biz də bir qədər növbədə dayandıq. Vaxt getdiyinə görə növbənin çatmağını gözləmədik, yolumuza davam etdik.

Yolda bir neçə nəfər haradan olduğumuzu soruşurdu. Laçından olduğumuzu deyəndə təəccüblə necə sağ qaldığımızı, hansı yoldan çıxdığımızı soruşurdular. Deyirdilər ki, Kəlbəcərin elə kəndləri var hələ də vəziyyəti bilmirlər, tam mühasirəyə düşüblər.

Bir qadın Kəlbəcərin Laçınla həmsərhəd kəndlərindən olduğunu dedi. Qadının saçı dağınıq, üzü şırım-şırım, qan içində idi, səsi batmışdı. Saçını yolmuş, üzünü cırmışdı. Dedi ki, martın 31-də ermənilər qəfildən yaşadıqları kəndə hücum edib. Erməni hücum edəndə qadın sacda çörək bişirirmiş: “Ermənilər bir oğlumu qətlə yetirdi, birini yaraladı. Oğlumun meyitini götürə bilmədik, təndirin yanında kolun arasında qoyub gəldik,

ermənilərlə döyüşə-döyüşə kəndi tərk etdik. Qızım, indən belə ordan sağ insan gəlməz. Tunelin o üzündən sonuncu çıxan bizik, yolda da heç kimi görmədik. Burdan çıxıb hara gedəcəksən, getməyə yeriniz varmı? Can ay körpə, bu uşaqları hara aparacaqsan?!" Qadın ağladı, mən də ağladım. Onlar ötüb keçdilər.

Axşama yaxın Murovu aşdıq. Murovdan xeyli aşağı düşmüşdük, bir maşın gəldi. Bizi maşına yığdılar. Xanlar rayonunun Toğana kəndinə gətirdi. Bizə sığınacaq verməsi üçün sürücü Toğana kəndinin icra nümayəndəsini axtardı. Dedilər ki, icra nümayəndəsi Kəlbəcərdən olan qaçqınları məskunlaşdırmaq üçün gedib.

Toğana kəndi qurtaranda yolun kənarında düşərgə salınmışdı. Sürücü bizi orada düşürdü. Burada yaxınlarını axtaranların sayı-hesabı yox idi. İnsanlar yolun kənarında dayanmışdı, gələn maşınların qabağına qaçıb yaxınlarını soruşurdular. Bir qadın havalanmışdı, xalasını axtarırdı, hamıya şəklini göstərib, ağlayırdı.

Bizi avtobusa yığıb Hacıkənddəki sanatoriya binasında yerləşdirdilər. Otaqlar isti idi. Ayağını şaxta vuranlara, qocalara, uşaqlara, yaralılara tibbi yardım göstərdilər. Bizi Toğanadan Hacıkəndə gətirən avtobusda da həkim vardı. Hacıkənddə qaldığımız gecədən heç nə xatırlamıram. Otağa daxil olan kimi yatmışam, bir də gün işığına, adamların səsinə oyanmışam.

Hacıkənd sakinləri başımıza toplandı. Çay, yemək verdilər, isti paltar gətirdilər. İnsanlar günümüzə ağlayırdılar.

Sərdar dayı dedi ki, gedək bizə, atangilin gəlməsi Allaha pənahdır, onların sağ qalmasına ümid böyük deyil. Gedək bizə, evdəkilər sağ çıxdığımı bilsinlər, mən yenə Murova qayıdacam, atangili soraqlayacam. Dedim ki, dayımgilə gedəcəyik. Gecə bir nəfər gəldi, dedi ki, tuneldə, Murovun ətəyində ağır döyüş olub. Sağ qalan olmayıb.

Biz Hacıkənddə olanda Murovun Kəlbəcər tərəfində qalan maşınımız gəlib çıxmadı. Yol tıxac, qar, buz, palçıq olduğuna görə maşın dağı aşa bilməmişdi. Qohumlar xəbər gətirdilər ki, Pəri İlyasova Murovda maşında donub. Pəri İlyasova iflic keçirmişdi, neçə il idi yataq xəstəsi idi. Murovun sərt şaxtasına, bir neçə günlük aclığa-susuzluğa dözməmiş, donub ölmüşdü.

Hacıkənddə qohumlarımız gəldi, onlar da dedilər ki, gələn yalnız sizsiz, kənddə qalanlardan heç bir xəbər yoxdur.

Növbəti gün avtobus verdilər, dedilər bu avtobus kim hansı ünvana getsə, ora aparacaq. Avtobus bizi Tərtər rayonunun Hüsənli kəndinə, bö-

yük dayım Hüseyn Talıbovun evinə gətirdi. Dayımgilin heç nədən xəbəri yox idi, vəziyyəti danışdım, atamın, anamın, iki qardaşımın kənddə qaldığını, onlardan bir xəbər olmadığını dedim. Hamı ağlayırdı. Dayım pencəyini götürüb evdən çıxdı, dedi ki, Murova gedirəm, əgər Zeynəbi (bacısı) tapmasam, sağ gəlməsə, mən qayıdan deyiləm. Aprelin 4-də dayım anamgillə birlikdə qayıtdı. Onlar erməni mühasirəsindən çıxmışdılar.

***

Bacılarım, qardaşlarım belə əzab və zülmlə Murovu aşıb Hüsənliyə gəlib çıxmışdılar. Bu möcüzə idi.

***

Biz o yerlərə mütləq qayıdacağıq. Murovun bəri üzündən aşıb piyada Oğuldərəyə qədər gedəcəm.

Xəritəyə, bələdçiyə ehtiyac yoxdur. Bütün yollar yadımdadır.

**ŞƏHİDLƏRİMİZ**

## RUHU NİGARAN GƏLİN



Səma Aydın qızı Kərimova 31 dekabr 1969-cu ildə Laçın rayonunun Nağdalı kəndində dünyaya gəlmişdi. 1974-cü ildə orta məktəbə getmiş və 1984-cü ildə orta məktəbi yaxşı və əla qiymətlərlə bitirmişdir. Elə məktəbi bitirdiyi il atası Aydın kişi Səmanı Bakıya V.İ.Lenin adına Dövlət Pedaqoji İnstitutuna (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti) aparır. Amma həmin il Səma ali məktəbə daxil ola bilmir. Səma sənədlərini yenidən həmin təhsil ocağına verir və 1986-cı ildə filologiya fakültəsinə daxil olur. İnstitutu bitirdikdən sonra isə peşə fəaliyyətinə Nağdalı kənd orta məktəbində başlayır.

1992-ci ilin may ayının 17-18-i Laçın işğal olunan zaman Səma və ailəsi də öz doğma yurd-yuvasını tərk etmək məcburiyyətində qalmışdılar. Səmagil Laçından çıxdıqdan sonra Bərdə rayon Qaradəmirçi kəndində yaşayan qohumlarıgilə pənah gətirmişdilər. Amma avqust ayında belə bir xəbər eşitdilər ki, Laçın əhalisi Laçına geri dönür və Səma da həyat yoldaşı ilə birlikdə avqust ayının 25-də Laçına geri döndü. Ancaq Laçında qalmaq çox da uzun sürmədi, mart ayında ermənilərin Kəlbəcərə hü-

cüm etdikləri xəbəri yayıldı. Mart ayının 31-də Səma dayısıgillə bərabər yenidən Laçını tərk etməyə məcbur oldu. 31 mart 1993-cü ildə Laçın eli üçün çox ağır bir faciə üz verdi. Səmagilin maşın karvanı Kəlbəcər rayonu ərazisində olan Tuneldə mühasirəyə düşdü. Mühasirə zamanı Səmanın dayısı Asif və bibisi elə ordaca dünyalarını dəyişmişdilər, Yusif dayısı ilə Səma isə yaralanmışdılar. Səmanı və digər əsir düşmüş yaralıları əvvəlcə Vəng kəndinə, sonra isə Xankəndində yerləşən uşaq xəstəxanasına gətirmişdilər. 1993-cü il may ayında anasına yazdığı məktubunda bildirirdi ki, qızı Nurlanə ilə birlikdə Xankəndində uşaq xəstəxanasındadı, 1 aydan çoxdur ki, yataqdadır. Ayağa qalxa bilmir. İçində güllə olduğuna görə sol ayağını tərpədə bilmir. Əməliyyat ediblər, az da olsa ayağının şişi çəkilib.

Səmanı və qızı Nurlanəni geri almaq üçün Səmanın ailəsi ermənilərlə danışaqlar aparırdılar. Tələb olunan məbləğ çətinliklə olsa da toplanmışdı. Ancaq ölümü əsirlikdən üstün tutan Səma özünə qəsd etmək qərarına gəlmişdi. Və may ayının 15-nə keçən gecə Səmanın ömrü sona çatdı. Səmanın qardaşı Əli Səmanı və Nurlanəni geri almaq üçün danışıqlara başladağı ermənidən Səmanın özünü öldürdüyünü eşitdikdə çox sarsıldı. Artıq Əli ermənilərdən bacısının cəsədini almağa çalışırdı. Səmanı Tuğ kəndində dəfn etmişdilər, ancaq onun cəsədinin geri alınacağını bildikləri üçün tabutda torpağa əmanət dəfn etmişdilər.

Uzun danışıqlardan sonra iyun ayının 23-də Səmanın cəsədi geri alınmalıydı. Əli və yaxın qohum-əqrəba həmin günü neytral zonaya toplaşmışdı. Əli erməni Ediklə görüşmək və bacısının cəsədini almaq üçün düşmən mövqelərinə doğru irəliləyirdi. Amma ermənilər hiylə işlədərək Səmanın cəsədini yox, həmin əraziyə boş tabut gətirmişdilər. Murdar ermənilərin daha ağlasığmaz və qəddar hiyləsi isə qarşıda imiş. Əliyə bacısnın cəsədini geri almaq üçün qəbirləri qazıb bacısının cəsədini özünün tapmalı olduğunu söylədilər. Əli bunu eşidəndə elə ordaca Ediki öldürə bilərdi, ancaq Səma yadına düşdükdə dözməli olduğunu başa düşürdü. Əli Edikin bu tələbini qəbul etdi və onunla birlikdə Tuğ kəndinə gəldi. Ağır olsa da Əli qəbirləri qazmağa başladı, qəbirləri qazıb tanınmaz hala salınmış insanları gördükdə qəzəbdən titrəsə də bunu düşmənə büruzə verməməyə çalışırdı. Ancaq bacısını da bu vəziyyətdə görəcəyindən qorxurdu. Əli on qəbir qazmışdı, amma hələ bacısının cəsədini tapa bilməmişdi. Düşünürdü ki, bəlkə heç bacısının cəsədi burda yoxdu. Ermənilər onu aldadırlar. Amma geriyə bir qəbir qalmışdı. Əli həmin qəbrə yaxınlaşdı və bacısının həmin qəbrdə olduğunu duymuşdu sanki. Qəbri qazma-

ğa başladı, bu qəbr digərlərindən dərin idi. Qəbri açdıqdan sonra tabutun qapağını qaldırdı və bacısının cəsədini gördükdə göz yaşlarını saxlaya bilmədi. Sonra qəbrə enib bacısnın cəsədini götürdü və cəsəd qucağında sərhədə doğru irəlilədi. Sonra Səmanın cəsədini Beyləqandakı "Şəhidlər" qəbristanlığının "Peyğəmbərlər" məscidində ata-baba qaydasıyla yuduzdurub, qırmızıya tutulmuş tabuta qoydurdular. Bərdənin Əyricə kəndinə gətirdilər və orada dəfn etdilər.

Səmanın cəsədi geri alındıqdan sonra Səmanın yadigarı olan Nurlanəni geri almaq haqqında düşünürdü hər kəs. Yenə də ermənilərlə danışıqlar başladı və onların tələblərini yerinə yetirməyə razı oldular. Səmanın ölümündən sonra əsirlikdə qalan Nurlanə, əsirlərin içində olan Arzu və Nəsibəyə meyl salmışdı. Nurlanəni geri almaqçün danışıqlar aparıldığı üçün ermənilər Nurlanəni əsirlər olan yerdən götürüb Tuğ kəndində yaşayan erməni Edikin anasının yanına gətirdilər. Nurlanə 10-15 gün orda qaldı. 2-3 günə tələb olunan məbləğ və erməni əsirlərinin qarşılığında Nurlanə ailəsinə geri verilməliydi. Amma yenə də azğınılaşmş ermənilər öz murdar əməllərindən qalmadılar və avtomatın qundağı ilə Nurlanənin boynunun arxasına vurub onu nurdan məhrum etdilər. Adı Nurlanə olan körpə ömürlük nura həsrət qaldı...

Avqust ayının 5-də yenə də qohum-əqrəba sərhədə toplandı və Nurlanəyə qovuşacaqları anı gözlədilər. Və o an gəlib çatdı, Nurlanənin dayısı Əli sərhədə doğru addımladı və Nurlanəni geri aldı. Nurlanə artıq neçə ildir ki, nura həsrətdi. Allah tezliklə onun gözlərinə nur bəxş eləsin.

Hal-hazırda Səma Kərimovanın təhsil aldığı Nağdalı kənd orta məktəbi onun adını daşıyır. Allah şəhid Səmaya rəhmət eləsin, məkanı cənnət olsun. İnşallah tezliklə Səmanın və bütün şəhidlərimizin qisasını almaq qismət olar!

**Ülviyyə Zamanlı**

## UNUTMA!

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib.

İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür.

Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.



